## MÜƏLLİFDƏN

Hər bir elin, diyarın özünə məxsus təbiəti, gözəlliyi, sərvəti var.

Bu təbii gözəlliyi bir az da gözəlləşdirən, onun dəyərli insanlarıdır.

İnsansız təbiətin də bir mənası yoxdur. İnsan o təbii gözəlliyi qorumalı, gələcək nəsillərə ötürməlidi. Bu təbiət insanlarla daha da gözəl olur. İnsansız təbiətin nə mənası.

Mən də bu kitabda bu gözəl diyarın dəyərli, elini obasını, insanlarını sevən kişilərin bir qismindən bəhs etmək istərdim. Burada mən müxtəlif peşə sahiblərini sizlərə tanıtmaq istəyirəm. Yaşlı və orta nəslin nümayəndələrinin əksəriyyəti bunlarla çiyin -çiyinə çalışmış, dostluq və yoldaşlıq etmişlər.

Gənc nəsil isə bunları tanımır.

Məqsədim yurdumuzun kiçik, lakin gözəl bir hissəsi olan Zəngilanın bu dəyərli insanlarını, onların yaşadığı həyatı onlara tanıtmaqdır.

Burada bəhs etdiyim insanların çoxu bu gün həyatda olmasalar da onların həyatı, yaxşı əməlləri, daima bizlərin yaddaşında əbədi qalacaqdır.

Gənc və yeni nəslin onlardan öyrənməli çox şey var.

Zəngilan rayonu Azərbaycanın rayonları arasında ərazisinə görə ən kiçik rayonlardan biridi.

Amma təbiətinə, sərvətinə görə deyərdim ki, ilk onluqdadı.

Ərazidən suyu qurumayan 4 (Araz, Oxçu, Həkəri və Bəsit) çay axır.

Azərbaycanın heç bir rayonunda belə çaylar yoxdur.

Zəngilanın daha bir sərvəti var ki, bunun da dünyada əvəzi yoxdur. O təbii çinar meşəsidir.

Sovet zamanında deyirdilər ki, bu dünyada ikinci çinar meşəsidir.

Bu gün əminliklə demək olar ki, bu təbii meşə dünyada ikinci yox, birincidir.

Birinci belə bir meşənin Kanada da olduğunu deyirlər.

Amma Kanadadakı təbii meşəlik çinar deyil, ağcaqayın meşəsidir.

Kanadanın bayrağındakı yarpaq da çinar deyil ağcaqayın yarpağıdır.

Bizim çinar meşəmiz dünyada əvəzi olmayan bir təbii sərvətdir.

30 illik işğal dövündə çinarların çoxu haylar tərəfindən kəsilmişdir.

2020-ci ildə Zəngilanın ərazisi ali baş komandan cənab İlham Əliyevin rəhbərliyi altında işğaldan azad edildi.

İnanırıq ki, çinar meşəsi öz əvvəlki halına qayıdacaqdır.

## Abbasov İdris Şəmil oğlu



Abbasov İdris Şəmil oğlu 1931-ci ildə Zəngilan rayonunun Gəyəli kəndində anadan olub. Erkən yaşlarından kənddə təsərrüfatda işləyib. 1952-1956-cı illərdə Sovet Ordusu sıralarında Macarıstan Respublikasında xidmət etmişdir. 1956-cı ildə Macar xalqı SSRİ-yə qarşı qiyama qalxmışdı.

Hərbi xidmətini başa vurduqdan sonra rayona qayıdan İdris Abbasov DTK orqanlarında işə qəbul olunmuşdur. Görünüşcə sürücü olsa da onun praporşik rütbəsi də var idi. Onun işi tək sürücülüklə bitmirdi.

O 1986-ci ilə kimi bu orqanda işləmişdir. Bu orqanda işləmək elə də asan və rahat deyildir. Bu sistemin veteranı ehtiyatda olan polkovnik-leytenant Bəxtiyar Süleymanlı onun haqqında xoş sözlər demişdir. Onun dediyinə görə işinə diqqət yetirən İdris Abbasov söz aparıb gətirən biri olmayıb. Kimsənin zərərinə bir məlumat verməyib. Rayonun işğalından sonra oğlunun yanına Naxçıvana getmiş və 23 sentyabr 1994- cü ildə orada vəfat etmiş elə orada da dəfn edilmişdir.

Üç oğlu, iki qızı var. Böyük oğlu Səfərdi. Digər oğlu Sərdar Abbasov «Azərbaycanın Fəxri Dəmiryolçu» olub. Rəhmətə gedib. Oğlanlarının hər üçü dəmiryolu maşinisti idi. Sonbeşik Sərvərin idarə etdiyi qatarı təxminən 1990-cı ildə o vaxt Mehri stansiyasında hay (erməni) quldur dəstələri saxlamış və ona işgəncə vermişdilər.

Qızları Səidə Aqrar Sənaye Bangında, Zərnişan isə Təhsil şöbəsində işləyirdi.

Abbasov İdris Şəmil oğlu yaxşı tikinti ustası, eyni zamanda da yaxşı bağban idi. Allah rəhmət eləsin

İdris Abbasova əlavə

**Asif Bağırovun dedikləri**: O qohum əqrabanın əksəriyyətinin

ev tikərkən dülgərlik işlərini təmənnasız görər, heç vaxt da gördüyü işləri dilinə gətirməzdi. Zəngilana təbii qaz çəkilən zaman idi. Idris də qaz çəkdirirdi. O qaz çəkdirməzdən əvvəl təzə tikdirdiyim ikimərtəbəli evimin bütün dülgərlik işlərini (döşəmədən, tavandan tutmuş damın qurulması, şiferlərin vurulmasına qədər hamısını təkbaşına görmüşdü, ona zəhmət haqqı verməyi təklif etmək olmazdı. Bir gün o bizə gələrək: Yeznə qaz çəkdirirəm, amma deyəsən pulu çox hesablayıblar dedi. Qaz çəkilişi idarəsindindən ona verilən sənədi İdrisdən almaq istədim. Məqsədim həmin pulu ödəmək idi. O, sənədi mənə vermədi, gülə-gülə: Yeznə mən sənin niyyətini başa düşürəm. Axı, mən iyirmi beş il orada işləmiş, oradan da təqaüdə çıxmışam, dedi. Idris Abbasov belə bir adam idi.

## Abdullayev Famil Məcid oğlu



Abdullayev Famil Məcid oğlu 1936-cı ilin noyabrında indiki Qubadlı rayonunun Ağbis kəndində anadan olub. (O dövrdə Ağbis kəndi Qubadlı rayonua tabe idi. 1964-cü ildən isə kənd Zəngilan rayonuna verilmişdi). O, 1941-42 tədris ilində Ağbis kənd ibtidai məktəbinin 1 sinfinə gedib. Abdullayev Famil Məcid oğlu 1951-52-ci dərs ilində Xocahan kənd orta məktbinin 10-cu sinfini bitirmişdir. 1952- ildə Pirçivan kəndinə gələn Famil Abdullayev Zəngilan rayon Mədəniyyət evinin müdiri vəzifəsində işləmişdir. Sonra o, Bakı ticarət Texnikumunun əmtəəşünaslıq fakültəsini bitirmişdir.

Abdullayev Famil Məcid oğlu 1955-ci ildən taleyini RİC ilə bağlamış və rayonun işğalına kimi burada işləmişdir. O 1970-ci ildən isə Rayon İstehlak Cəmiyətində ticarət şöbə müdiri işləyib.

Abdullayev Famil hal hazırda təqaüddədir və Bakı şəhərində yaşayır.

**Abdullayev Məhəmmədəli Məcid oğlu**



Abdullayev Məhəmmədəli Məcid oğlu 1927- ci ildə rayonun Ağbis kəndində anadan olub. Ağdaş kənd təsərrüfatı texnikumunu bitirən Məhəmmədəli Abdullayev sonralar rayon mərkəzinə köçmüşdür. O burada bir çox idarələrdə o cümlədən Rayon Mərkəzi Xəstəxanasında mühasib işləyib. Abdullayev Məhəmmədəli Məcid oğlu 15 sentyabr 1971-ci ildə vəfat etmişdir.

Həyat yoldaşı Qocayeva Roza Niyazalı qızı müüəllimə idi. Onların 5 oğlu, iki qızı var.

**Alməmmədov Oruc Müseyib oğlu**



Alməmmədov Oruc Müseyib oğlu 1925-ci ildə Pirçivan kəndində anadan olub. Pirçivan kənd məktəbini bitirib. 1943-cü ildə səfərbər edilərək döyüşən ordyua göndərilmişdir. Müharibədən sonra doğma rayona qayıdan Oruc dayı mühasiblik kursunu bitirmişdir. O uzun illər 54 il 6 ay Zəngilan rayon Aqrar Sənaye Bankında mühasib, baş mühasib işləmişdir. Böyük Vətən Müharibəsinin I qrup əlili idi. Sinəsini orden və medallar bəzəyir.

Alməmmədov Oruc Müseyib oğlu 1993-cü ildə rayonumuzun Ermənistan Respublikasının Silahlı Qüvvələri tərəfindən işğalından sonra Bakı şəhərində məskunlaşmışdır. Burada da bir neçə il Xırdalan qəsəbəsində yerləşən Aqrar Sənaye Bankının Zəngilan şöbəsində öz fəaliyyətini davam etdirmişdir.

Alməmmədov Oruc Müseyib oğlu I dərəcəli «Böyük Vətən Müharibəsi» Ordeni və bir neçə medalla, «Fəxri Fərman»la təltif

olunub.

Oruc dayı 20 oktyabr 2014-cü ildə Bakı şəhərində vəfat etmişdir.

Onun 6 övladı, 13 nəvəsi, 21 nəticəsi var.

Övladları bunlardı:

-qızı Ofeliya 1952-ci ildə Pirçivan kəndində anadan olub.

-qızı Səlbi 1955-ci ildə Pirçivan kəndində anadan olub.

-oğlu Nəsib u 1957-ci ildə Zəngilan qəsəbəsində anadan olub.

-qızı Solmaz 1959-cu ildə Zəngilan qəsəbəsində anadan olub.

-qızı Sərfinaz 1962-ci ildə Zəngilan qəsəbəsində anadan olub.

-qızı Gülşən 1964-cü ildə Zəngilan qəsəbəsində anadan olub.

**Atlıxanov Əşrəf Ismayıl oğlu**

*polis mayoru*



Atlıxanov Əşrəf Ismayıl oğlu 1938-ci ilin avqust ayında rayonun Yusiflər kəndində anadan olub. O 1947-ci ildə Sayıflı kənd 7 illik məktəbinin I sinfinə daxil olmuş, 1951-ci ildə həmin məktəbi bitirmişdir. Sonra o Zəngilan qəsəbə orta məktəbində oxumuş, 1957-ci ildə orta məktəbi bitirmişdir.

Atlıxanov Əşrəf 1957-1959-cu illərdə Sover Ordusu sıralarında hərbi xidmətdə olub. Hərbi Xidmətini başa vurduqdan sonra rayona qayıdan Əşrəf 1960-cı ildə rayon DIS-də pasport masa bölməsində katib kimi əmək fəaliyyətinə başlamışdır. Istehsalatdan aryılmadan 1966-cı ildə M.K Rizayev adına Bakı milis məktəbinə daxil olan Əşrəf Atlıxanov 1969-cu ilə oranı hüquqşünas ixtisası üzrə bitirmişdir.

1970-ci ildə Atlıxanov Əşrəf Ismayıl oğlunu Naxçıvan MR-nın Sahbuz rayonuna SƏDM üzrə inspektor təyin edirlər. Iki il orada işlədikdən sonra onu Naxçıvan şəhərinə eyni işə dəyişdilər.

Sonra o 1975-1983-cü illərdə Naxçivan MR- nın keçmiş Noraşen (indiki Sədərək) rayonunda pasport masa rəisi işləmişdir. Rəhmətliyin dediyinə görə onun heç bir günahı olmadan işdən azad etmişlər. Milis oqranlarından azad edildikdən sonra rayona qayıdan Atlıxanov Əşrəf Ismayıl oğlu 1985-2010–cu illərdə əvvəlcə Zəngilan rayon XDS IK-də, sonra isə Icra Hakimiyyətində Mülki Müdafiə Qərərgahının rəisi işləmişdir.

Atlıxanov Əşrəf Ismayıl oğlunun üç oğlu var. Gözəl insan, yaxşı yoldaş olan Atlıxanov Əşrəf Ismayıl oğlu 18 iyul 2010-cu ildə Bakı şəhərində vəfat etmişdir. Allah rəhmət eləsin.

Həyat yoldaşı İsmayılova Sima Piri qızıdı. Onların İsmayıl, Rövşən və İntiqam adlı üç oğlu var.

**Babayev Eldar Nəriman oğlu**

*rayon Mərkəzi Xəstəxanasının sabiq baş həkimi*



Babayev Eldar Nəriman oğlu 1950-ci ildə Pirçivan kəndində (indiki Zəngilan şəhəri) anadan olmuşdur. 1957-1967-ci illərdə qəsəbə orta məktəbində oxumuşdur. Orta məktəbi bitirəndən sonra Azərbaycan Tibb İnstitutuna daxil olan Eldar Babayev 1973-cü ildə oranı bitirib. Rayona gələndən sonra Gilətağ kənd xəstəxanasının baş həkimi kimi əmək fəaliyyətinə başlayıb. 1989-cu ildə rayon Mərkəzi xəstəxanasının baş həkimi seçilən Eldar Babayev 2015-ci ilə kimi bu vəzifədə işləmişdir.

Həyat yoldaşı Təhməzova Nuridə Ziyad qızıdır. Onların iki oğlu və iki qızı var

Babayev Eldar Nəriman oğlu 14 Aprel 2021-ci ildə Bakı şəhərində dünyasını dəyişmişdir.

**Bağırov Asif Kərim oğlu**

*Pionerlər evinin direktorlarından*



Bağırov Asif Kərim oğlu 1947-ci ilin 01 yanvarında Zəngilan rayonunun Pirçivan kəndində anadan olub. 1954-55-ci tədris ilində Pirçivan kənd orta məktəbinin I sinfinə getmiş, 1966-cı ildə Zəngilan qəsəbə orta məktəbinin 11-ci sinfini bitirmişdir.

O, 1967-1970-ci illərdə Zəngilan rayon Mədəniyyət şöbəsində müxtəlif vəzifələrdə işləmişdir. 1967-ci ildə V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji institutunun Naxçıvan filialının tarix fakültəsinə qəbul olunsa da ora getməmiş, 1969-ci ildə Azərbaycan Dövlət Pİ-nun tarix (qiyabi) fakültəsinə qəbul olub. 1974-cü ildə oranı müvəffəqiyyətlə bitirmdir. Asif Bağırovu ali məktəbdə oxuyarkən 1970-ci ilin sentyabr ayında onu rayon Pioner və məktəblilər evinə direktor təyin etmişlər.

Sovet zamanında Pionerlər evinin nüfüzu məktəbdən heç də geri qalmırdı. Sovet gəncləri burada ilk olaraq bu quruluşu dərk edir, onun layiqli kardları kimi tərbiyə edilirdilər. Bu işin davamı isə orta məktəbdə həyata keçirilidi.

A.Bağırov 1978-1979-cu illərdə Bakı zona Komsomol məktəbini bitirmişdir. Məktəbə Zaqafqaziya Respublikalarından dinləyicilər gəlirdilər. 1989-cu ilin oktyabrından 1991- ci ilin sonuna kimi isə Asif Bağırov daha bir mədəni quruma, rayon Kini-video qurğuları idarəsinə rəhbərlik etmişdir. 1992-ci ilin 01 yanvarından oktyabrına kimi rayon İcra Hakimiyətində məsləhətçi olmuşdur. 1992-ci ilin oktyabr ayından Zəngilan rayon Qiyabi axşam orta məktəbin direktoru işləmişdir.

Rayonumuzun işgalı ərəfələrində Asif Bağırovu 01 senytabr 1993-cü ildə rayon Təhsil şöbəsinə inspektor göndəririlər. Burada o, 2015-ci ilin yanvarına, yəni təqaüdə çıxana kimi gənc nəslin tə-

lim-tərbiyəsi ilə məşğul olmuşdur. Asif Bağırov ailəlidir üç övladı, 6 nəvəsi var. O Qarabağ Müharibəsi veteranı, eyni zamanda rayon Ağsaqqallar şurası sədrinin müavinidir.

İşlədiyi müddətdə onun əməyinə layiqincə qimyət verilmişdir. Xeyli təltifləri var. O, dəfələrlə Azərbaycan LKGİ MK- nin, Respublika Təhsil Nazirliyinin, Rayon İcra Hakimiyətinin, rayon Təhsil şöbəsinin «Fəxri Fərman»ları ilə təltif olunub. O rayonumuzdakı istedadlı uşaqların seçilib rayon müsabiqəsinə, oradan da Respublika turuna göndərilməsində əsas simalardan biri olub. Məhz onun rəhbərliyi altında bir çox istedadlı gənc sənhəyə ilk olaraq ayaq basıb. Asif Bağırov eyni zamanda həm rayonumuzu, həm də Azərbaycanı Ümumittifaq Pioner təşkilatı olan «Artek» də təmsil edib. Asif müəllimə gələcək işlərinə əvvəl cansağlığı, səadət və uğurlar arzulayırıq.

PS. Asif Bağırov çoxsahəli insandır. İxtisasca tarix müəlimi olmasına baxmayaraq bizlər onu yaxşı qarmon ifaçısı kimi tanıyırdıq. Mən son illərə kimi onun musiqi təhsili olmadığını bilmirdim.

Özünün dediyinə görə qarmon çalmağı qardaşı Şəhriyardan öyrənib. Bu insanın Zəngilanda xoş niyyətlə açmadığı qapı yoxdu. Özünün dediyinə görə 2000 dən yuraxı toy çalmışdır. Bilirsiniz bu nə deməkdir. Orta hesabla hər toyda 200 adamın iştirak etdiyini nəzərə alsaq bu 400 min adama sevinc bəxş etməkdir. O rayondan əlavə qonşu Qubadlı, Cəbrayıl, Füzuli, Naxçıvan, Ordubad habelə Ermənistan SSR-nin Qafan, Qacaran şəhərlərində, Gorus, Sisiyan və Vedi rayonlarında dəfələrlə el şənlikləri keçirib.

Onun fəaliyyəti bununla bitmir. Eyni nzamana o bədii yaradıcılıqlada məşgul olur. Indiyə kimi onun Zəngilanla bağlı və digər mövzularda 200-ə yaxın elmi, publisistik və bədii yazıları çap olunub. Onun bədii yaradıcılığının zirvəsi isə rayonun işğalından sona nəşr etdirdiyi «Doğma yurda qayıtmaq istəyinə boy verən Zəngilan lətifələri» kitabıdır.

Mən bu kitabı oxuyandan sonra çox şey öyrəndim. Rayonu-

muzdakı bəzi insanları onun vasitəsi ilə yaxından tanıdım.

Son olaraq. Asif müəllim canınız sağ gününüz xoş ruziniz bol olsun ki, qələminizi hər zaman işlədəsiniz.

*«Artek» (rus. *Арте́к*) — Ukrayna ərazisində, Krım yarımadasında beynəlxalq uşaq mərkəzi. Krım yarımadasının cənub sahilində, Qurzuf qəsəbəsinin yaxınlığında yerləşir. Vaxtilə keçmiş SSRİ-nin ən məşhur pioner düşərgələrindən biri olmuşdur. Uzun müddət sosialist ölkələrindən gələn nümayəndələrin və xarici dövlət rəhbərlərinin qaldığı yer olub. 1991-ci ildə o Pioner təşkilatının dağılmaından sonra adi bir tətil yerinə çevrildi.

**Bağırov Qubad Allahqulu oğlu**



Bağırov Qubad Allahqulu oğlu 1929-cu ildə ildə Zəngilan rayonunun Keçikli kəndində anadan olub. O, 1943- cü ildə bir qrup Zəngilanlı məktəbli ilə Füzuli şəhərinə mühasibatlıq-hesabdarlıq kursuna göndərilib. Üç aylıq kursu bitirdikdən sonra rayona qayıdan Qubad Bağırov müxtəlifr kolxozlarda hesabdar, baş mühasib işləyib.

Əmək fəaliyyətinə 1943- cü ildə başlayan Qubad kolxozda hesabdar köməkçisi işləyib. Füzulidəki kursu bitirdikdən sonra Sobu kəndindəki «Qızıl Əkinçi» kolxozuna hesabdar göndərilib.

Sonralar baytar həkmi olma həvəsi ona güc gəlib.

Orta təhsilinin davam etdirmək üçün əvvəl Zəngilan kənd məktəbində 1 il oxuduqdan sonra Pirçivan kənd məktəbinə keçib.

Orta təhsil alıdıqdan sonra Qubad Bağırov indiki Gəncə şəhərindəki Kənd Təsərrüfatı İnstitutuna daxil olub. 1953-cü ildə ali məktəbi bitirdikdən sonra rayona qayıdır və baytar həkimi kimi əmək fəaliyyətini davam etdirir.

Bir müddət sonra onu Keçikli kəndinə kolxoz sədri göndərir-

lər. Orada işlədiyi qısa müddət ərzində özünü bacarıqlı bir kadr kimi göstərir. Elə həmin il onu Baytar müalicəxanasına rəis təyin edirlər.

Qubad Bağırov bu vəzifədə 1980-ci ilə kimi işlədi. Baş həkimlikdən getdikdən sonra da öz sevimli peşəsini davam etdirmişdir.

İşlədiyi müddətdə əməyi yüksək qiymətləndirilmiş, orden və medallarla təltif olunmuşdur.

O illərdə Ermənistandan Zəngilana dabaq xəstəliyi keçir. Haylar iddia edirlər ki, xəstəlik Zəngilandan bizə keçib. Məsələ uzanır və Moskvadan belə mütəxəssis çağırırlar. İşin gedişində Qubad həkim sübut edir ki, xəstəlik bizdən onlara yox, onlardan bizə keçib.

Qubad Bağırov 2022-ci ildə Bakı şəhərində vəfat etmişdir.

## Bağırov Şamı Kərim oğlu



Mən Sobu kəndində doğulsam da, Zəngilan şəhərindəki 28 aprel küçəsində böyüyüb boya-başa çatdım. Məhəlləmizdə müxtəlif təbəqədən olan insanlar yaşasa da, qulluqçular üstünlük təşkil edirdi. Buradakı insanlardan biri olan Şamı Kərim oğlu Bağırovdan danışacağam. Məhəlləmizdəki ən yaxşı ev də Şamı dayının evi idi. Bu adam mənim nəzərimdə belə qalıb. Mən düşünürəm ki, Şamı dayının öhdəsindən gəlmədiyi iş yoxdur.

Şamı dayı öz işini bilən, yaxşı qazanan, eyni zamanda da imkanslızlara xərcləyənlərdən biri idi. Məscid düzü əsasən pirçivanlıların qədim yaşayış yeridi. Bizlər Pirçivana sonra gəlmişik. O məhəllənin xeyri-şəri onsuz keçməzdi.

Belə misallar çoxdu. Şamı dayı çox insanı çətin vəziyyətdən, həbs olunmaqdan qurtarıb. Sonda mən də anamdan eşitdiyim bir

hadisəni yazmaqla yazımı bitirim.

Mənim atam Rayon İstehlak Cəmiyyətində (el arasında bu təşkilata raypo deyərdilər) fəhlə, anam isə mağazalardan birində süpürgəçi işləyirdi. Bir dəfə anamın danışdığı bir hadisə məni bu qənaətə gətirdi ki, Şamı dayı hər işin, xüsusilə də maliyyə işinin öhdəsindən əla gələr. Anam deyirdi ki, mağazadakı satıcılardan birinin ayağında mal (el arasında belə deyərdilər) qalıb. Onun dediyinə görə, o vaxtkı pulla, 5 və ya 6 min rus pulu idi. O, dövr üçün bu böyük məbləğ idi.  Bu pula bir ev və ya  maşın almaq olardı.

Satıcı qadın ağlayır, dərdinə çarə axtarırdı. Rayon İstehlak Cəmiyyətində hansı baş bilənə dərdini dedisə, çarə tapılmadı, dedilər ki, mümkün deyil, gərək ödəyəsən.

Günlərin bir günü bir nəfər ona deyər ki, kağızları bir Şamı qağaya da göstər. Qadın da eləmə tənbəllik dərdini ona anladar. Şamı dayı deyər ki, sənədlərini gətir baxım.

Uzun sözün qısası Şamı dayı o işi çürütdü və qadından Rayon İstehlak Cəmiyyəti bir qara qəpik belə ala bilmədi. Bax Şamı dayı işini belə bilən biri idi.  Mən deyərdim ki, Şamı dayı rayonumuzun Karl Marksı idi.

***

1973-cü il idi.  Detmirin (Zəngilan şəhərindəki uşaq aləmi mağazası- Ə.S) sağ pəncərəsindən tünd göy rəngdə kostyum asılmışdı. Qiyməti də 59 manat idi. Bilmirəm nə qədər kostyuma baxmışam amma, yenə baxmaq istəyirdim. Məhlə uşaqlarından kimsə qolumdan tutub məni xəyallarımdan ayırdı və biz evə getdik.

Axşam Şamı kirvə ilə Şəfiqə xala (Allah hər ikisinə rəhmət eləsin) bəzə gəldilər. Bir çay süfrəsindən sonra məni yanına çağırıb:

-Kişibala, bir yoxla görüm razmeri əyninə düzdür.

Sumkadan detmirdə gördüyüm kostyumu çıxarıb mənə uzatdı. Əynimə kitab kimi oturmuşdu. Səhərə qədər fikirlıəşdim ki,

Şamı kirvə nə bilib ki, bu kostyum mənim ən böyük arzumdur.

Şəhər kostyumu geyinib getdim məktəbə. Qayıdanda detmirin qabağından keçəndə Xanpəri (Uşaq aləmi mağazasının müdiri-Ə. S) xala kostyuma baxıb:

-Sən dünən kostyuma baxanda Şamı kirvən yolunan keçirdi. Sən gedəndən sonra gəlib kostyumu götürdü. Deməк sənə alırmış. Belə kişilər var idi. **Elçin Cavadlı**

***

**İxtisarla bəzi sətirlər.**

**....Bu da Zəngilansız 21 il. Əslində indi kövrək xatirələrə çevrilən, vaxtaşırı yuxumuza girən doğma torpaqlarımızın bir anı belə onsuz keçirdiyimiz 7670 gündə heç vaxt qəlbimizdən silinməyib. Əgər maddi durumun imkan verirsə dünyanın lap o biri başına da gedib-gələ bilərsən. Təkcə doğulub boya-başa çatdığın yurda baş çəkmək, oradan sağ-salamat qayıtmaq müşgül məsələdir. Səbəbi hamıya məlumdur. Hər birimiz yaşadığımız ömrümüzün müxtəlif illərində ailə üzvülərimizdən, yaxın qohum və dostlarımızdan tanrının hökmü ilə vidalaşmalı olmuş, müəyyən bir müddətdən sonra həmin itgilərlə barışmışıq.**

Yazımın başlığının birinci hissəsi hamımıza məlumdur. Bəs Şamil kimdir? Şamil 2012-ci ilin qarlı-şaxtalı fevral ayının 10-da axşam saat 17 radələrində başa vurduğu 85 illik şərəf və ləyaqət dolu ömrünün 70 ilindən çoxunu zəngilanlıların xeyir-şərinə sərf etmiş, şəxsiyyəti və qeyri- adi bacarığı ilə seçilən, uşaqdan böyüyə hamının sevimlisi, xeyirxahlıq, səxavət, cəsarət, namus-qeyrət rəmzinə çevrilmiş Bağırov Şamil Kərim oğlunun əsl adıdır. O, mənim doğmaca böyük qardaşımdır. Ona aid bütün sənədlərdə-şəxsiyyət vəsiqəsi, əmək kitabçası, hərbi bilet, tələbə bileti, ali-təhsil haqqında diplom, Sover Ordusu və Hərbi Dəniz Donanmasının otuz və əlli illik yubleyləri ilə əlaqədar təltif olunduğu medallarda «Əmək veteranı» medalında, təqaüd (pensiya) kita-

bçası və sair Bağırov Şamil Kərim oğlu yazılmışdır.

Akif Kərimlinin «Zəngəzurun qeyrət qalası Nüvədi» kitabında 1918-ci ildə haylara (erməni)lərə qarşı vuruşmalarda xüsusi fəallıq göstərən Mustafa uşaqları: Kərbəlayı Ələkbər, Kərbəlayı Nəbi, Ələsgər, Cahangirin adı hörmətlə çəkilir. Onlar anamın doğmaca dayılarıdır. Qardaşların böyüyü Məşədi Əmir (Qurban və Mansur Mustafayevlərin, Ruqiyyə və Gülarə xanımların ataları) və kiçiyi Mehdi Pirçivanda (indiki Zəngilan şəhəri) yaşamış və öz əcəlləri ilə dünyalarını dəyişmişlər. Kərbəlayı Ələkbər İrana, oradan İraqa qaçıb. Sonrakı taleyi məlum deyil. Ələsgəri (Cəmil, Suqrət Mustafayevlərin, Rəxşəndə xanımın ataları) Sovet Hakimiyyəti ermənilərə görə güllələyib. Kərbəlayı Nəbi ilə Cahangiri Qazaxıstana sürgün ediblər. Iosif Stalinin ölümündən, Mircəfər Bağırovun həbsindən sonra bəraət alsalar da heç biri həyatda olmayıb. Kərbəlayı Nəbinin ömür-gün yoldaşı Şərxan xanım və övladları 1956-cı ildə Azərbaycana qayıtmış, oğlanları Bəhmən və Qüdrət ömürlərinin axırınadək yüksək dövlət vəzifələrində işləmişlər. Cahangirin nəvəsi və adlısı Cahangir isə son vaxtlaradək Oş vilayətinin (Türkmənistan) baş prokuroru vəzifəsində çalışıb.

Şamilin Şamı adlandırılması anamın dayıları ilə bağlıdır. Atamın dediklərinə görə sürgündən əvvəl Pirçivan kəndində yaşayan Kərbəlayi Nəbi həmişə Şamili sevərək Kərimin evinin Şamı adlandırmış, 8-9 yaşlı Şamilin fərasəti, qohumcanlılığı, əməksevərliyi onu valeh edərmiş. Sonralar bu ad rəsmi adı kölgədə qoyub. Şamil nəinki evimizin nəsil- kökümüzün həmçinin əsil pirçivanlıların şamına çevrilib.

Şamilin qısa bioqrafiyasına gəldikdə: O, 1927-ci ilin iyun ayının 16-da Pirçivanda kəndli ailəsində dünyaya gəlmiş, orta məktəbin 7-ci sinfini əla qiymətlərlə bitirmiş, müharibənin başlanması ilə əlaqədar təhsilini yarımçıq qoymuş, M.S,Bağırov adına kolxozda mühasib köməkçisi, baş mühasib, RTTS-də baş mühasibin köməkçisi vəzifəsində işləmiş, 1943-cü ilin may ayında Qaryagin (indiki Füzuli rayonu) rayonunda 22 nəfər zəngilanlı ilə

birlikdə 3 aylıq mühasibat kursunu əla qiymətlərlə bitirmişdir. Bu barədə rayonumuzun görkəmli ağsaqqal ziyalılarından, «Şərəf nişanı» ordenli, ali-təhsilli baytar həkimi Bağırov Qubad Allahqulu oğlunun geniş, hərtərəfli və maraqlı faktlarla zəngin xatirələri var.

Ş.Bağırov 1946-cı ildən (ayını bilmirəm) 1952-ci ilin oktyabr ayının 30-a dək Sovet Ordusu sıralarında xidmət etmiş, 54063-cü hərbi hissədə (1947-ci ilin Fevral ayından 1948-ci ilin fevral ayınadək) katib,1948-ci ilin aprelindən 1950-ci ilin aprelinədək 20796-cı hərbi hissədə böyük (starşi pisar) katib, 1950-ci ildən 1952-ci ilin okttyabr ayının 30-dək 20796-cı hərbi hissədə starşina rütbəsəində hərbi qulluğunu başa vurmuşdur. Böyük bir hərbi hissənin təhcizat işinə rəhbərlik edən Şamili gələcəkdə həm ixtisas təhsili, həm də yüksək vəzifədə rütbələr gözləyirdi. Anamızın qəfəil ölümü (1951-ci ilin ortaları) təqribən il yarımdan sonra onu Zəngilana qayıtmağa vadar etmuşdi.

Zəngilana qayıtdıqdan sonra az müddət Zəngilan Hərbi Komissarlığında, Suvarma Sistemləri İdarəsində baş mühəndis, 1953-cü ilin aprelindən 1957-ci ilin martınadək M.C.Bağırov kolxozunda baş mühasib, həmin aydan 1959-cu ilin noyabr ayınadək Rayon ipək idarəsində baş mühasib, noyabr ayının 20-dən 1964-cü ilin dekabr ayının 18-ə dək Rayon istehlak Cəmiyyətində baş mühasib. 1965-ci ilin yanvar ayından 1968-ci ilin mart ayınadək Rayon İpək İdarəsində əvvəlcə baş mühasib, az sonra direktor vəzifələrində, 1968-ci ilin iyun ayından 1975-ci ilin noyabr ayınadək Rayon Əhaliyə Məişət Xidməti Kombinatında baş mühasib, paralel olaraq (avqust, sentyabr, oktyabr ayları) 1975-ci ilin avqust ayından 1989-cu ilin mart ayınadək Rayon İpək İdarəsində baş mühasib, həmin ildən Zəngilan rayon Baytarlıq idarəsində ömrünün son illərinədək baş mühasib vəzifəsində çalışmışdı.

Şamil daha uzunömürlü ola bilərdi. 1993-cü ildə Zəngilanın işğalı, 1997-ci ilin fevralında sədaqətli ömür-gün yoldaşı Şəfiqə xanımın gözlənilməz ölümü, nəhayət 2007-ci ilin dekabr ayının

axırlarında axşamüstü rayon maliyyə şöbəsindən çıxarkən binanın qabağındakı piyada səkisində qaz maşını yol hərəkətini pozaraq onu vurmasaydı.

Maşın vurarkən başından zədə alan Şamil özünə gələn kimi hadisəni törədən, geyim-keçimindən kasıblıq yağan cavan sürücüyə: - tez aradan çıx, sən məni, mən də səni görməmişəm, demişdi. Bunu mənə hadisənin yeganə şahidi olan Elbəyi Əlifov danışmışdı. Bu qəzadan sonra Şamil üç ildən artıq öz vəzifəsində işlədi. Onun övladları hər dəfə atalarının işə gedib-gəlməsindən narahat olurdular. Övladlarının mənə, mənim isə ona olan xahişimdən sonra sözümü yerə salmadı. Öz ərizəsi ilə 70 illik əmək fəaliyyətindən aralandı.

Bir neçə il heç hara çıxa bilməməsi, xeyirdən, şərdən aralı düşməsi, övladlarının, yeznələrinin hədsiz diqqət və qayğılarına, qohum-əqrəbanın, dost və tanışların tez-tez baş çəkməsinə, telefonla əlaqə saxlamasına baxmayaraq, sözünü hər yerdə deməyi bacaran, əməlləri saysız- hesabsız yaxşılıqlarla dolu, simasından nur yağan bu azad fikirli şəxsiyyət el-obadan təcrid olunması ilə barışa bilmədi. 2012-ci ilin fevralında ürəyi əbədi olaraq dayandı.

Məscidə yuyat üçün həmin gün aparılsa da dəfn ertəsi gününə qaldığına görə iynə vurulmalı idi. Tibb işçisi gələndə otaqda böyük qızı Nəzakət xanımla mən idim. Xahiş etdim ki, heç kəsi içəri buraxmasınlar. Nəzakət ağlaya-ağlaya mənə yaxınlaşdı və əlindəki sənədi uzatdı: Bu Şamilin ali təhsil haqqında diplomu, arasında isə atam Kərimin,  anam Dilişin 1951-ci ildə ölümündən bir-iki ay əvvəl çəkdirdiyi yeganə şəkil idi. Valideynlərinə 85 yaşlı övladın sonsuz hörməti və məhəbbətinin ifadəsi….Oğulsan belə vəziyyətdə özünü ələ al.

Dəfn günü qəbirüstü mərasimdə rayon rəhbərliyi mitinq keçirtdi. Havanın əlverişsiz olmasına baxmayaraq Xırdalan qəbiristanlığına yüzlərlə adam yığılmışdı. Ilk Cümə günü isə minlərlə adam Şamilə ehtiramını bildirməyə gəlmişdi.  Böyük mərasim salonunun,  əlavə təşkil olunmuş çadırın qurulmasına baxmayaraq

çöldə dayananların sayı –hesabı bilinmirdi. Zəngilanlılar ən çox sevdikləri, məsləhət və ümid yeri bildikləri müdrik ağsaqqalarından birini itirmişdilər. Belə bir qələbəliyi mən ancaq Zəngilanda rəhmətlik Seyid Həsən Ağanın yas mərasimində görmüşdüm. Şamilə qarşı belə bir sayğı onun illər boyu təmənnasız yaxşılıqlarının bəhrəsiydi. Burasınn deyim ki, Şamilin sayəsində bütün qohum-əqrabam kimi sayılmışam. Cibimin pulu olub, tərbiyə və təhsilimdə, müəyyən vəzifələrə irəli çəkilməyimdə, xeyirə şərə az-çox yaramağımda, xeyirxah niyyətlərlə yaşamağımda onun rolu əvəzsizdir.

Ağlım kəsəndən Şamilin xeyirdə, şərdə müstəsna xidmətlərinin şahidi olmuşam. Keçən əsrin 60-cı illərinin axırlarınadək Pirçivanda hüzr düşəndə birinci növbədə hamı Şamili soruşurdu. Daha doğrusu kasıbların, əlsiz- ayaqsızların himayədarına çevrilmiş Şamili hamıdan əvvəl orada görərdin. Hamı ondan məsləhət alsa da müəyyən hallarda onun özü Şaxsuvar əmi ilə hesablaşardı. Qəbir qazmaq, odun gətirmək, çadır qurmaq, yuyatçı, molla, aşbaz, çayçı, heyvan almaq, yağ, düyü tədarükü və sairə bu kimi işlərdə həmişə özünü qabağa verərdi.

Pirçivan qəbirstanlığı köhnə Pirçivanda Ət Tədarükü İdarəsinin qabağında yerləşirdi. Torpaq olduqcan bərk daş və çınqıldan ibarət idi. Onu qazmaq üçün o dövrlərdə heç bir texnika olmadığından qəbrlər fiziki güclə hazırlanırdı. Qocalı, cavanlı hamı təmənnasız, minnətsiz yuxarıdakı, yəni dəfn işlərini icra edirdilər. Şamil Rayon İpək idarəsində işləyərkən bir neçə dəst çadır almışdı. Bu çadırlar təmənnasız olaraq zəngilanlıların xeyr-şər məclislərində istifadə olunurdu. Uzun illər Pirçivanlıların yas mərasimində kişi qeyrəti ilə heç bir umacağı olmadan əziyyətlər çəkmiş və yadımda qalan bir neçə nəfərin adını yada salmaq istəyirəm: Pirçivandan Rüstəm əmi, Müslüm əmi, Tumas əmi, Həsən əmi, Qoca oğlu Usub (Yusif), Cavanşir, İldirxan, Kamran, Məhərrəmov Tofiq, Əhmədov Qabil, Mafura, Sahat oğlu Abbas, köhnə Pirçivandan Qarayev Mikayıl, Quluş kirvə, Məmmədvəli əmi,

onun oğlu Nuru, Kərimov Atlıxan, Gürşad, Cəbrayıl, Şəmil və sairə. Biz bu adamlara maddi və mənəvi cəhətdən həmişə borcluyuq. Dünyasını dəyişənlərə rəhmət, həyatda qalanlara can sağlığı arzulayırıq. 1980- ci ildən üzübəri zəngilanlıların xeyir-şərinin təmənnasız ağsaqqallarından biri də Tariyel (Ümid) Misirxan oğlu Rəhimovdur. Zəngilan və Şamil haqqında söz açanda bu adamı yaddan çıxartmaq olmaz.

Şamilə hörmət gətirən bir neçə cəhəti saymaq istəyirəm:

İşlədiyi idarə və müəssisədə böyük nüfuz sahibi olub, idarənin rəhbəri ona inanıb, etibar edib. Planlar və öhdəliklər vaxtında yerinə yetirilib. Heç kim həbsə məruz qalmayıb. Halbuki, RİC-də və ipək İdarəsində bu mümkün deyildi. Bu iki təşkilatı zəngilanlıların çoxu «Qan ocağı», və ya «Tələ» adlandırırdılar. 25 ildən artıq həmin idarələrdə çalışan Şamil çox adamı zindanlardan xilas edib. Belə hallar rayon rəhbərliyində, eyni zamanda müvafiq baş idarə və nazirlikdə, habelə Zəngilan ictimaiyyətində onun barəsində həmişə yüksək rəy formalaşdırırdı.

1956-cı ilin fevral ayında Şamilin toyu ərəfəsində gonşumuz Yunis vəfat etdi. Yunis cavan idi. Üç uşağı (Kazımova Tamella, Kazımov Telman və sonbeşik Hüsaməddin) yetim qalmışdı. Əslən Malatkeşin kəndindən olan zurnaçı Seyidalı kişiyə 200 manat pul verən Şamil Seyidalı dayıya deyir ki, «Dayı, yeyin, için, lakin toy çalınmayacaq». Az keçməmiş Yunisin həyat yoldaşı Tərlan Əsgərovanı öz yanında (M.C.Bağırov kolxozunda) naryadçı vəzifəsinə işə götürdü.

Şamil qonaqpərvər, əliaçıq (ürəyi kimi) və səxavətli adam idi. Bir gündə dəfələrlə onun süfrəsi qonaq-qara üzünə açılardı. Ömür-gün yoldaşı Şəfiqə xanım həmişə evinə gələn adamları gülərüzlə qarşılayıb yola salardı. Şamil qohum-əqrəbadan, dost-tanışdan, qonşulardan xəstələnən olsa idi, əli dolu vəziyyətdə ona baş çəkərdi. Çox vaxt Şəfiqə xanımı da, məni də özü ilə birlikdə aparardı. Şamil rəhmətliklər Seyid Həsən Ağanın, Seyid Hüseyn Ağanın, Zeynalabdin Ağanın, həm özlərinin, həm də oğ-

lanlarının ən yaxşı, etibarlı dostlarından hesab olunardı. Rəhmətlik Hacı Ağa Şamili özünə böyük qardaş sayır, onun bir sözünü iki etməzdi.

Təhsilini davam etdirmək üçün Moskvaya, Malenkova teleqramma vuran Şamil başağrısı çəksə də Pirçivan kənd orta məktəbinin nəzdində axşam növbəli qiyabi orta məktəbin açılmasına nail olmuş, buranı bitirdikdən sonra Xalq Təsərrüfatı İnstitutuna qəbul imtahanları verib 5 il qiyabi təhsil alan Şamil iqtisadçı peşəsinə yiyələnmişdi. Müxtəlif səbəblər üzündən təhsilləri yarımçıq qalmış Rayon Maliyyə şöbəsinin müdiri Əliş Əliyev, Rayon Bankının müdiri Mustafa Mustafayev, Rayon Yağ-Pendir Tədarükü idarəsinin müdiri Məmmədalı İmaməliyev, Maliyyə şöbəsinin büdcə müfəttişi Bəylər Həsənov və onlarla başqaları bu qiyabi məktəbi bitirəndən sonra müxtəlif ali və orta ixtisas məktəblərində təhsil aldılar. Məktəbin açılışının səbəbkarını bilənlər həmişə Şamilə minnətdarlıq edirdilər.

Zəngilandakı batalyona şəhər sakinləri müəyyən köməkliklər göstərəndə (çarpayı, qab-qacaq, yorğan-döşək, Allahverdi Qasımov, Cabbar Imamverdiyev, Qurban və Mansur Mustafayevlər, Zülfüqar Məmmədov və başqaları) Şamil də onların arasında idi.

Nəhayət Zəngilan blokadada olanda 66 yaşlı Şamil Bağırov, 65 yaşlı İsa Əkbərov, 65 yaşlı Qurban Mustafayev, 58 yaşlı Çingiz Əsədov da əlinə avtomat alaraq gənclərlə birlikdə rayonun müdafiəsinə qalxmışdılar.

Yuxarıda sadaladığım və bir qismini yazmadığım xüsusiyyətlər Şamilə hərtərəfli hörmət qazandırmışdı. Bir neçə tanınmış adamın Şamil haqqında dediklərini olduğu kimi qələmə almağı mövzuya müvafiq hesab edirəm. Zəngilan və Qubadlıda böyük nüfuza malik, hər iki rayonda jurnalist kadrların yetişməsində müstəsna xidmətlər göstərmiş qocaman jurnalist, «Kənd həyatı» rayon qəzetinin baş redaktoru Mürsəl Eyvaz oğlu Qocayevin təxminən 40 il öncə söylədiyi bir cümlə:

**Şamı Zəngilanın açar-qıfılıdır.**

Uzun müddət Rayon İstehlak Cəmiyyətində əmtəəşünas, ticarət şöbə müdiri vəzifələrində çalışmış **Famil Abdullayev:**

60-cı illərin əvvəlləri, isti yay günlərindən biri idi. Şamı baş mühasib, mən isə əmtəəşünas vəzifələrində işləyirdik. Bakı şəhərinə «Azətittifaq»a gəlmişdik. Eşitdik ki, rayonumuzdan olan Məmmədov İsa dənizdə boğulub, meyidi morqdadır. Ora gələndə Davud Həsənovu, Tofiq Hacıyevi, İsa kişinin tələbə oğlu Yusif Məmmədovu gördük. Şamı morqa girib meyidi tanıdı. Onu çıxartdırıb məsciddə yudurtduqdan sonra tabuta qoydurdu. Bütün xərcləri özü çəkdi. Üstəlik mənə pul verib dedi ki, bunlar həm yorğundurlar, həm də həyəcanlı. Get onların yolları üçün yemək və su al. Şamı belə Şamı idi.

Şamillə həm axşam məktəbində, həm də ali məktəbdə bir oxumuş, ömrünün çox hissəsini Zəngilan rayon Maliyyə şöbəsində büdcə rəisi vəzifəsində işləmiş **Bəylər Həsənov:**

Şamı Bağırov təkcə Pirçivana, Zəngilana deyil, həm də Azərbaycana Allahın bəxş etdiyi nadir insanlardan idi. Bu namuslu, qorxmaz və comərd şəxsiyyət insanlara çörək vermək, əl tutmaq, yaxşılıq etmək üçün dünyaya gəlmişdi. Ya qismət, bir də belələri yetişə...

«Şərəf nişanı» ordenli baytar həkimi **Qubad Bağırovun** Şamillə bağlı xatirələrindən bir neçə epizod:

Şamillə 1943-cü ilin may ayında tanış oldum. Onun 16, mənim isə 13 yaşım var idi. O, Pirçivanda, mən isə Keçiklidə kolxozda hesabdar köməkçisi işləyirdim. Bizi (22 nəfəri) Qaryagində (indiki Füzuli rayonu) üç aylıq mühasibatlıq kursuna göndərdilər. İlk gündən Şamı bütün parametrlərə görə bizdən seçilirdi.

Şamı kursu əla, Hüseynlə mən isə bir dörd, qalanları beşlə bitirdik. Şamının xatirini məktəbin direktoru və onun həyat yoldaşı Zümrüd xanım çox istəyirdilər. Onların fikiri Şamını orada saxlayıb oğulluğa götürmək idi. Bu niyyətlərlə Pirçivana gəlsələr də Kərim dayı yaxşı bir süfrə açdırmış, amma razılıq verməmişdi. Şamı dostluqda sədaqətli, qayğıkeş, ləyaqətli, həyatda pak bir

insan idi.

Qubadlı rayonunda uzun müddət baş mühasib işləmiş (1963-cı illərdə Zəngilanla Qubadlı birləşəndə Zəngilanda RXMŞ-nin baş mühasibi işləyib. Xalq Təsərrüfatı İnstitunda vaxtilə tədris edilən, heç fələyin də baş açmadığı «Əhməd əməliyyatının» müəllifi, xeyirxah və mərd insan **Əhməd Əhmədovun** dediklərindən:

Şamı mənim qardaşımdır. Kişi adamdır. Bərkdə, boşda çox dəyanətlidir. Hər yerdə kişi adamlar var, amma Şamı kimisi azdır. O zaman Zəngilan-Qubadlı birləşəndə biz çox istədik ki, «Raypo»ya da özümüzdən baş mühasib qoyaq. Doğrusu ona gücümüz çatmadı. O, təkcə mənim yox, Qubadlıdan çox adama qardaş və dostdur.

Zəngilanda uzun müddət müxtəlif tikinti təşkilatlarına rəhbərlik etmiş, ədəb-ərkanı, davranışı ilə böyük nüfuz qazanmış **Səhiyəddin Ağayev:**

Şamı Zəngilanın tacıdır. Zəngilanı Şamısız, Şamını Zəngilansız təsəvvür etmək balığın quruda yaşaması kimi bir iddiadır. Şamı böyük qızıma elçiliyə gəlmişdi. Qızımı istəyən isə Həşimov İbadullanın oğlu Rəşid idi. Tərəddüd içindəydim. Ailəyə və oğlana tam bələd deyildim. Anam fikrimi duydu: «Bala, gör qapımıza kim gəlib? Anamın sözündən, Şamının gəlişindən çıxılmaz vəziyyətdə qalmışdım. Ona böyük hörmətim var idi. Həm də bilirdim ki, Şamının oğlan tərəfdən ağlı bir şey kəsməsə mənim qapıma gəlməz.. «Hə» dedim. Az keçməmiş yaxşı ailədə gözəl tərbiyə almış Rəşid oğlanlarımdan biri kimi özünü göstərə bildi.

Uzun illər rəhbər vəzifədə işləmiş **Yadulla Hacıyev:**

Şamıdan məsləhət almaq istəsən, çox diqqətli ol. Onun verdiyi məsləhətlərdən eləsi olar ki, ona əməl etsən bütün karyeranı 180 dərəcə müsbətə dəyişər.

Respublikanın Prokurorluq orqanları veteranı, Zəngilan şəhərində qapı bir qonşumuz**- Rəsul İmaməliyev:**

Şamı dayı elə şəxsiyyətlərdəndir ki, tərəf müqabilinin kimliyindən asılı olmayaraq onu özünə tabe etdirə bilir.1978-ci ilin

iyun ayının əvvəli idi. Şamaxıda işləyirdim. Atam qəflətən bərk xəstələndi. Müayinədən sonra məlum oldu ki, sağalmaz xəstəliyə düçar olub. 5-10 günlük ömrü qalıb. Çox sarsıdıcı bir hadisə ilə üzləşmişdik. Mən ailənin böyük oğlu idim. Atamın arzusu mənim toyumu görmək idi. Onun belə durumunda isə mənim ailə qurmağım mümkün deyildi. Üstümə bir çox hörmətli adamlar salsalar da onların dedikləri beynimə girmədi. Biz atamıza Məmi deyə müraciət edirdik. O, isə məni Məşədi adlandırırdı. Hər yerdən əli üzülən atam;- Məşədini ancaq Şamı başa sala bilər demişdi. Şamı dayı məni evimizdəki kiçik otaqlardan birinə saldı. İlk cümləsi ilə birbaşa mətləbə keçdi:

Mən elə bilirdim ki, çoxlu dostları olan İmaməliyevin heç bir nəfər də olsun düşməni yoxdur. Sən demə yanılmışam. İllər boyu əziyyətini çəkdiyi, təhsil verdiyi, vəzifəyə qoydurduğu bir adam onun ən qəddar düşməni imiş. Bu onun xəstəliyindən də ağır dərddir.

Bilirsən ki, Məminin 10-15 günlük ömrü qalıb. Övlad toyu görməyib, nigaran gedir. Sən də o qədər namərd adamsan kı, o kişiyə təkcə bir dəfə yaxşılıq edə bilərdin, onu da etmədin.

Mən, qeyri ixtiyari ağlaya ağlaya:- Şamı dayı, özün necə məsləhət bilirsənsə elə də et, dedim.

O, Əli dayımı səsləyib: - get Piri kişi ilə toyun gününü təyin eləyin, dedi və dərhal bizdən getdi.

**Kənd zəngilanlı Məşədi Şəhrux Əzimov:**

Əgər Şamı RİC-də baş mühasib olmasaydı mən Azgizdə (kitab-dəftər, yazı ləvazimatları satışı mağazası) müdir və satıcı işləyəndə külli miqdarda əsgiyimə görə əlli-ayaqlı getmişdim. İndi yəqin ki, sümüklərim də çürümüşdü. Ona canım qurban.

**Rayon İşıq Satışı idarəsinin nəzarətçisi İbrahim Niyazov:**

Şamı qağa Zəngilanın ən mötəbər ağsaqqallarındandır. Gözü, könlü tox adamdır. Ağayanadır. Onun köməkliyi, birbaşa təmənnasız yardımı sayəsində Gilətağ kəndində mağaza müdiri işləyən qardaşım Səxavət onu gözləyən uzun müddətli həbsdən azad ola bildi.

Doğma yurdumuz Zəngilan haqqında, onun sayılıb, seçilən şəxsiyyətlərindən biri barədə yazımı bitirərkən həmyerlilərimlə bərabər bütün işğal olunmuş rayonların sakinlərinə tezliklə öz ev-eşiklərinə qayıtmağı arzulayıram. Şamilə (Şamıya) gəldikdə isə sağlığında ona həmişə qağa demişəm. Bu gün də ruhun qarşısında baş əyib, qəbrin nurla dolsun deyirəm, qağa! **A.Bağırovun** «Azərbaycan övladı» qəzetinin 28 oktyabr 2014-cü il tarixli 44 (2713) nömrəsində Zəngilansız 7670 gün, Şamısız 991 gecə yazısından.

## Şamı Bağırov haqqında xatirələrim

Mən Şamı Bağrırovla 1943-cü ilin may ayında tanış oldum. O vaxt mən Keçikli kəndi «Kalinin» kolxozunda hesabdar köməkçisi işləyirdim. Şamı isə Pirçivan kəndi M.C.Bağırov adına kolxozda hesabdar köməkçisi idi.

O vaxt kadr çatmadığı üçün bir çox rayonlarda qısa müddətli mütəxəssis hazırlayan kurslar açılmışdı.

Bizi də Karyagin (indiki Füzuli) rayonunda açılmış 3 aylıq hesabdar (mühasib) hazırlayan kursa göndərməli oldular. Anam eşitdi ki, Kərim dayının oğlu Şamını da həmin kursa məsləhət biliblər. Kərim dayı ilə atamgilin qohumluğu var idi. Çünki, mənim atamın anası Mehri rayonunun Nüvədi kəndindən idi. Atamın qohumları orada çox idi. Dayıları Kərbəlayi Fərəc, Məşədi İbad kənddə sayılan adamlardan olub. Kərim dayı ilə qohumluqda oradan idi. Ona görə də biz həmişə rayona (Pirçivana) gələndə ya Kərimdayı gildə, ya da yetim Xəlil (Quliyev Xəlil) gildə qalardıq. Xəlil ilə anam siğə qardaş-bacı idilər. Ona görə də biz bütün ailə üzvləri Xəlili (Allah rəhmət eləsin) doğma dayılarımızdan çox istəyirdik. Biz hər il yaylağa gedəndə Gülüstan (Xəlilin bacısı) da bizimlə gedərdi. Bütün yayı bizdə qalardı. Ona görə də biz ona doğma bacı kimi baxardıq.

Ona görə də anam məni Xəlilgilə gətirdi, Xəlillə birlikdə Kərim dayı (Allah rəhmət eləsin) gilə getdik. O bizi doğma kimi

qəbul etdi, gəlişimizin səbəbini soruşdu. Anam dedi ki, eşitmişəm Şamı (Allah rəhmət eləsin) Karyaginə kursa gedir. Qubadı ona tapşırmaq üçün xahişə gəlmişik. Kərim dayı dedi:

-Qubad kimdir, o da Şamınun biridir. Biz qohumuq bunu Şamıda bilir. Ona görə arxayın ola bilərsən. O doğma qardaş kimi ona baxacaq.

O vaxt Şamınun 16, mənim isə 13 yaşım var idi. Ona görə də anam gecəni orada qalıb sabah arxayın kəndə qayıtdı.

Biz rayondan təxminən 22 nəfər kənd təsərrüfatı şöbəsində qeydiyyatdan keçib yola düşdük. Poezdlə (qatarla) Horadiz stansiyasına gəldik. O vaxt qatar gecə Horadizə çatırdı. Ona görə də biz stansiyanın həyətində torpaq üzərində gecələdik. Ağcaqanad da bizi yatmağa qoymadı.

Samı dedi ki, durun gəzin təzək (quru inək peyini) tapın yandıraq. Onda ağcaqanad bizə toxunmayacaq. Biz belə də etdik.

Bizimlə birlikdə Pirçivandan Bahar (poçta işləyən, telefonçu), Məliklidən Xanı, Məlikli şofer (partizan) Yunisin arvadı, (Məlikli Hüsüyə də qohumluğu çatır), Mincivandan Xansuvar (sonralar dəmiryolunda kassir və revizor işləyirdi), Qıraq Müşüləndan Əsədov Mahmud, Ramazan Fərhad oğlu (lavka sürücüsü), Sobudan Tovus Süleyman qızı İsmayılova (anası Göyərçin xala anamın yaxın qohumu idi) Məşədi İsmayıllıdan Həmidov İskəndər (arada Mincivan Dəmiryolu xəstəxanasında təsərrüfat müdiri işləyirdi. Rayonda lotereya ilə ilk «Moskviçi» udmuşdu), İçəri Müşlandan Alıyev Alı Əýyub oğlu (Yağ idarəsinin mühasibi, o hamıdan yaşda böyük idi), Xırda Qışlaqdan Müzəffərov Hüseyn Həsən oğlu (Aqropromda mühasib işləyirdi), Pirveyisdən İmanov İbiş Süleyman oğlu (Canbarda anbardar, mühasib, ferma müdiri işləmişdi), Seyidlərdən İbrahim kənddə aqronom, briqadir işləyib), Məmmədbəylidən Əjdər müəllim, Hüseynbəylidən Həsənov Abdulla (son zaman Yenikənddə ferma müdiri, zootexnik işləyirdi), Xanlıqdan Sənan, Zilanlıdan Məhəmməd, və s. cəmi 22 nəfər idik. Onlardan Bahar, Ramazan, İbrahim, Abdulla, Sənan

zootexnik, qalan uşaqlar isə mühasiblik şöbəsində oxuyurdular.

Biz hamımız səhərə qədər Horadizdə qaldıq. Səhər dedilər ki, Qaryaginə 30 km yoldur. Piyada getmək çox çətindi. Ona görə siz ora ancaq Horadiz taxıl tədarükü məntəqəsinə taxıl gətirən öküz arabaları ilə gedə bilərsiniz. Ona görə də biz taxılqəbulu məntəqəsinə gedib Qaryaginə gedən öküz arabasını axtardıq. Şamının fərasəti, və çevikliyi sayəsində biz iki öküz arabasına minib yola düşdük. Araba bütün gecəni yol getdi. Yolda Şamı, mən, Hüseyn Alı, Xanı, Bahar Tovus, Mahmud, İbiş və İskəndər getdiyimiz arabanın təkəri çıxdı. Biz arabadan yıxıldıq, hərəmizin bir yerimiz yaralandı. Şamının ayağı bərk əzilmişdi. Ona yolda soyuq suya batırılmış əski (onun öz köynəyini cırıb sarıdıq) qoyduq. Səhərə kimi yol gəlib Füzuliyə çatdıq. Məktəbin yerini soruşub tapdıq. Məktəb şəhərin aşağı hissəində açıq bir yerdə idi. Ətrafında kolxozun meyvə bağı və taxıl əkilmiş zəmilər var idi. Məktəbdən 400-500 metr aralıda dəyirman var idi. Dəyirmanda çəkçi işləyən Sevdayar adlı bir kişi idi. O Pirçivanlılarla qohum idi. Yəni Mustafayev Qurbanın bacısı Ruqiyyənin əri idi. Şamı onu tanıyırdı. Ondan başqa «döş Qulu» ləqəbli (Quliyev Qulu) da var idi. O Quliyev İskəndərin əmisi oğlu idi və Füzulidə milis işləyirdi. Şəhərə, bazara o nəzarət edirdi. Bir də Qaraxanbəyli kəndində Mehti adlı bir nəfər var idi. O da yetim Xəlilin qohumu idi. Şamı onu da tanıyırdı. Başqa tanışımız və ümid yerimiz yox idi.

Biz 1943- cü ilin may ayının 4-də məktəbə getdik. Onda məktəbin direktoru Ağakişiyev Atakişi idi. O həm də tarixdən dərs deyirdi. Direktorun arvadı Zümrüd Ağakişiyeva isə Azərbaycan dilindən dərs deyirdi. Zavuç isə Səhbiyalı müəllim idi. O kolxoz mühasibatından, Şirxan müəllim isə hesabdan dərs deyirdilər. Biz dərsə 4 mayda başladıq. Sinifkom isə Füzulidən Cəmil adlı bir nəfəri seçdilər. O, birinci gündən Şamı ilə dost oldu. Bu dostluq 1993-cü ilə kimi davam etdi. Şamı bizim hamımızdan yaxşı oxuyurdu. Zümrüd müəllimənin uşağı olmurdu. O Şamını öz oğlu kimi sevirdi. Hətta o əri ilə birlikdə Pirçivana gəlib Kərim dayıya

qonaq olub və ondan xahiş edib ki, Şamını ona oğulluğa götürməyə icazə versin. Ancaq Kərim dayı buna icazə verməyib.

Bir dəfə bir gecə kolxozun meyvə bağından gavalı oğurlamağa getmişdik.

Bir az gavalı yığandan sonra gözətçi bizi gördü və qovaladı, biz qaçdıq. Yolda Hüseyn köhnə bir quyuya düşdü, bütün gecəni axtarsaq da onu tapa bilmədik. Səhərə yaxın həzin bir səs eşidib onu tapıb quyudan çıxartdıq.

İyul ayının ortaları idi. Hamımızın pulu və çörəyi qurtardı. Biz ağır bir vəziyyətə düşdük. Fikirləşdik ki, ya Quludan ya da Sevdayardan borc pul alaq. Birdən Şamı dedi ki, mən utanıram borc almağa.

Mən dedim ki, Samı onda sabah bazardı dərs yoxdu, gedək Ayıbasanlı kəndində biçilən buğda zəmisinin yerindən başşaq yığaq və döyüb buğda eləyək.

Bu təklifi hamı bəyəndi və Şamı dedi ki, hamı bir nəfər kimi gedək. Biz hərəmiz bir meşok (kisə) götürüb başşaq yığmağa getdik. Axşama qədər yerə tökülən sünbüllərdən hərəmiz bir meşok yığdıq. Onu gətirib məktəbin həyətində sünbüllərini daşla döydük, təxminən 3 meşok, 130-140 kiloya qədər buğda oldu. Biz bir əl arabası tapıb buğdadan bir meşok (50 kq) apardıq dəyirmana.

Sevdayar dayı heç bir şey almadan buğdanı üyüdüb bizə verdi.

Biz unu qızlara verib dedik ki, xəmir yoğurub çörək bişirin. Qızlar qonşudan lazım olan şeyləri alıb saca çoxlu yuxa (lavaş) bişirdilər və hamımıza bərabər böldülər. Qalan buğdanı arabaya qoyub bazara apardıq. Bazarda buğdanın kisəsi 100 manata idi. Biz buğdanı satmaq istərkən bazarkom bizi incitdi. O dedi ki, bunu haradan almısınız. O buğdamızı satmağa qoymadı. Bu vaxt Samı dedi ki, mən Qulunun yerini tanıyıram

Getdi və onu tapıb gətirdi. Qulu bazarkomu söydü və buğdanı alıb bizə verdi. Biz buğdanı satdıq və pulunu bərabər böldük. Axıra kimi pulumuz oldu.

Samı, mən, Alı, Hüseyn və İbiş bir otaqda yatırdıq. Alı bizdən

böyük olduğu üçün bizi incidirdi. Ən çox da məni.

O hər axşam məni şəhərin içində olan kəhrizə göndərib sərin su gətirtdirib içirdi. Bir dəfə səhər uşaqlar məni qovaladı su gətirə bilmədim. Alı məni döydü. Axşam Alı yatanda Şamı dedi durun Alını krovata (çarpayı) sarıyaq və onu döyək. Biz elə də etdik. Alının qollarını, ayaqlarını kriovata bağladıq. Şamı gerzovoy sapoqu (uzunboğaz dəri çəkmə) mənə verdi və dedi qorxma onu yalvarana kimi döy. Mən elə də elədim Alı bizi hədələdi və söydü. Şamı dedi sən söz ver ki, Qubadı bir də suya göndərməyəcəksən. Onda biz səni azad edərik. O, and içəndən sonra Şamı onu azad etdi. Ondan sonra Alı məni suya göndərmədi.

Bir dəfə Qaraxanbəylidən Mehti gəlib Şamı ilə məni qonaq apardı, Bizə yaxşı qulluq elədi. Yolumuza da təndir fətiri (çörək) və pendir qoydu.

Onun qohumu Mirələm (o Mehtinin qohumu idi) sonralar bizim rayona prokurorun müstəntiqi kimi gəldi. O vaxt o yetim Xəlilgildə qaldı. Şamı və mən onu bir neçə dəfə aparıb hörmət etdik. Ona dedik ki, sənin qohumun Mehti bizə hörmət edib.

Deməк biz iyul ayının axırında imtahan verdik. Şamı bütün fənnlərdən 5 aldı. Mən Azərbaycan dilindən, Hüseyn isə riyaziyyatdan 4 aldıq. Qalan qiymətlərimiz 5 oldu. Ona görə də 3 nəfərə, Şamıya mənə və Hüseynə baş mühasib işləməyə vəsiqə verdilər. Qalan uşaqlara mühasib köməkçisi və ferma mühasibi işləməyə icazə verildi. Biz rayona gəlib sənədlərin surətini rayon Kənd Təsərtüfatı idarəsinə və III katibə təqdim etdik. O vaxtb kadro işinə III katib baxırdı. Biz hamımız əvvəlki yerimizdə işlədik. 4-5 aydan sonra məni Sobu kəndi «Qızıl Əkinçi» kolxozuna, Şamını Pirçivan kəndi M.C.Bağırov adına kolxoza, Hüseyni isə Bürünlü kəndinə L.Beriya adına kolxoza baş mühasib göndərdilər.

Şamı ilə dostluğumuz o vaxtdan axıra qədər davam etdi. Şamı çox təəssübkeş, qeyrətli təvazökar, dostluğa sadiq, ehtibarlı, iradəli adam olub. Şamı sonralar təhsilini artırıb qiyabi yolla orta məktəbi və ali məktəbi bitirib.

Rayonda ən bacarıqlı mühasiblərdən biri olub, rayon İstehlak Cəmiyyətində, rayon İpək idarəsində, tikinti təşkilatlarında Baytar müalicəxanasında baş mühasib, idarə rəisi vəzifələrində işləyib. İşlədiyi yerlərdə kolektivin hörmətini qazanıb. Şamı ilə mənim dostluğum axırda hərtərəfli qohumluğa çevrilib. O rayonun ictimai işlərində həmişə fəal, təşəbbüskar olub. Əmək və müharibə veteranı olub. Allah ona rəhmət eləsin. Qəbri nurla dolsun.

**Dostluq.** Məhəmməd bəy Zəngilanlı.

Dostum məndən bir əmanət istədi
Umudvaram yaxın vaxta çatdıram
İxtiyarım cata, qüdrətim yetə
Yaxşı min dərdimi yamana verəm

Divan olsam nainsafa çox nəşəm
İsbat olan cinayətə tək bəsəm
Qanmazın ömründən qayçı ilə kəsəm
Aşkara götürüb qanana verəm

Məhəmmədəm eşq oduna yanıram
Niyə danım şövkətimi şanımı
Əzrayıldan saxladığım canımı
Layiqəti mərfəti qanana verəm

Doğrudan da, həqiqətən də Şamı ləyaqətli, mərifətli, sədaqətli, qayğıkeş bir dost idi.

1955-ci ilin yay ayları idi. Şamı Pirçivandakı M.C.Bağırov adına kolxozda baş mühasib, mən isə baş baytar həkimi işləyirdim. Kolxozun sədri isə Qırax Müşlan kəndindən olan Məmiş Cəfərov idi. Rayon partiya komitəsinin I katibi Məmmədtağı Na-

ğıyev idi. (H.Yadullanın qayınatası idi. Allah hər ikisinə rəhmət eləsin) Rayon İcraiyyə komitəsininn sədri isə Şəfahət Mehtiyev idi.

Büro iclasında kolxozlarda kəsir qalan qara malın baş (sayını) planını doldurmaq üçün kolxozlara mal-qara almaq üçün vəsait ayrılırdı. Hər kolxoza bir nəfər rəhbər işçi təhkim edilirdi. Məni Pirçivandakı M.C.Bağırov adına kolxoza təhkim etdilər. Mən kolxoz sədri ilə görüşdüm, kəsir qalan 50 baş iri buynuzlu mal-qaranı almaq üçün bazaya getməyi düşündüm

Bu vaxt Şamı dedi ki, Mehri rayon Galır kolxozunun sədri Sosik mənim dostumdur. Oraya getsək boş qayıtmarıq. Sədr buna çox şad olub dedi:

-Onda Şamı, Qubad həkim o vaxtb kolxozda təftiş komissiyasının sədri işləyən Əhmədov Qabil (törə Qabil) ora getsin. Ona görə də Qabillə çoxlu pul verdilər və biz Mehriyə getməli olduq. Qatarla Qafana, oradan da Müsəlləmə getdik. Gecəni Əcili kəndində İsax kişinin evində qaldıq. (İşaq kişi mənim əmim Keçikli Yəhya ilə kirvə idi). O bizi çox yaxşı qarşıladı, bizə quzu kəsdi. Səhər isə bizə 3 at təşkil etdi Pirçivan malı yerləşən Yağlı Dərə yaylağına getdik. Gecəni fermada qaldıq. (O vaxt mal fermasının müdiri sürücü Adışirinin atası Əziz dayı idi). Səhəri atları minib Galir kəndinə getdik. Yolda qoyun fermasının müdiri Armo ilə görüşdük. O bizə quzu kəsdirib kabab verdi. Sonra sədrin otağına apardı. Sədr bizi çox səmimi qarşıladı və dedi ki, 20 baş dövlət damazlıq idarəsi tərəfindən uçota alınıb. Düyələrdən başqa hansı malı istəsəniz onu sizə verərəm. Elə də oldu. Biz 50 baş cavan düyə seçib aldıq. Pulu kolxozun kassasına verib qəbz aldıq. Mən arada bir baş ağqulaq arıq mal seçib dedim ki, onuda bizə verin. Sədr etiraz etdi və dedi ki, mən sizə artıq heyvan verməzəm. Mən isə həmin heyvanı mütləq aparmalıyam, dedim. Sədr sağıcını çağırıb o düyənin hansı inəyin balası olduğunu soruşdu. Sağıcı dedi ki, filan inəyin balasıdı, anası bütün inəklərdən çox süd verir. Gündə 25-30 litr.

Sədr dedi ki, sən cavan da olsan əsil mütəxəssissən. Onu sənə pulsuz bağışlayıram. Beləliklə biz 51 baş malı alıb ferma müdirinə, çobana təhvil verib yaylağa qayıtdıq. Həmin mənə bağışlanan düyə doğanda 25-30 litr sür verdi. Onu 17 bala doğana qədər saxladım. Hər dəfə də dişi bala doğurdu. Bütün qohumlara onun damazlığından verdim. Şamı mənə dedi ki, sədr bizə çox hörmət etdi. Biz ona nə hörmət edək. Mən dedim dağda mənim bir atım var, onun da bir yaxşı erkək balası, onu sədrə bağışlaya bilərəm. Şamı buna çox şad oldu səhəri həmin atı minib yenidən Galıra qayıtdıq. Dayçanı sədrə bağışlayıb qayıtdıq. Sonradan öyrəndim ki, sədr düyəni atla dəyişməsini idarə heyətində müzakirə edib. Dayçanı kolxoza gütürüb, sonra da onu sədr atı kimi istifadə ediblər.

Şamı Galırdan özünə, mənə və Qabilə bal alıb pay verdi. O, çox əliaçıq, qonaqpərvər bir insan idi. Allah ona rəhmət eləsin. Amin. **Bağırov Qubad Allahqulu oğlu. 28 avqust 2013-cü il.**

## Bağırov Şəhriyar Kərim oğlu



Bağırov Şəhriyar Kərim oğlu 1935-ci ildə Pirçivan kəndində anadan olub. Pirçivan kənd orta məktəbində oxumuşdur. Məktəb illərində tar, qarmon, nağara çalmağı öyrənmişdi. Eyni zamanda yaxşı əl qabiliyyəti var idi. Son dövrlərdə şəhərimizin küçələrini bayramlarda bəzəyən şüarların əksəriyyətini Şəhriyar Bağırov yazardı.

Yeddinci sinfi bitirəndən sonra Salyan şəhərindəki Kənd Təsərrüfatı Texnikumunu yer quruluşçusu ixtisası üzrə bitirib.

Texnikumu bitirdikdən sonra Pirçivandakı M.C.Bağırov (sonralar Oktyabr) adına kolxozda naryadçı, komsomol komitəsinin

katibi, Pirçivan kənd sovetində baş mühasib, Mədəniyyət şöbəsində qırmızı çadır müdiri, evlər idarəsinin müdiri, rayon Əhaliyə Məişət Xidməti Kombinatında sex müdiri vəzifələrində işləmişdir. Şəhriyar Bağırovun sözün həqiqi mənasında gözəl əl qabiliyyəti var idi. Bu adam gərək Mədəniyyət şöbəsində, orta məktəblərdən birində əməkmi, deyim nəğməmi, deyim rəsmxəttmi, deyim müəllimi kimi işləsəydi ondan balalarımız daha çox şey öyrənərdi nəinki ƏMXK da dəmir tor toxumaqla.

Şəhriyar Bağırov təxminən 1960-cı ildə axşam məktəbində orta təhsil alıb. Bağırov Şəhriyar Kərim oğlu 1985-ci ilin yanvar ayının 24-də axşam evə gedərkən Şərab zavodunun yaxınlığında maşın vurması səbəbindən, qardaşı Asif Bağırovun dediyi kimi «nəsihətsiz-vəsiyyətsiz» dünyadan köçdü. Natiq adlı bir oğlu var. Allah ona rəhmət eləsin övladına da sağlıq versin.

**Bayramov Həsənalı Alı oğlu**

*Respublika Jurnalistlər Birliyinin üzvü*



Bayramov Həsənalı Alı oğlu 1932-ci ildə Zəngilan rayonunun Məlikli kəndində kolxozçu ailəsində anadan olub.

Atası böyük Vətən Müharibəsində həlak olmuşdur. Sonra isə anası və qardaşı da vəfat etmiş və kiçik Həsənalı tək və kimsəsiz qalmışdır. Vaxtında təhsil ala bilməyən Həsənalı Bayramov 20 yaşında, 1951-1952-ci illərdə Zəngilan kənd orta məktəbinin 7 sinfini bitirir. Sonra o, Bakıya gələrək əvvəl Mədəni-Maarif Texnikumunda oxumuş və oranı Fərqlənmə Diplomu ilə bitirmiş, Azərbaycan Dövlət Universitetinin Kitabxanaçılıq fakültəsinə imtahansız qəbul olunub. Eyni zamanda qiyabi olaraq o, Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Azərbaycan dili və ədəbiyyatı şöbəsinidə bitirmişdir. Məktəbi bitirəndən sonra təyi-

natla M.F.Axundov adına Azərbaycan Respublika Kitabxanasına işə göndərilmişdir. Bir müddət sonra rayona qayıdan Həsənalı Bayramov rayon mədəniyyət şöbəsində inspektor, mərkəzi kitabxanada müdir, yerli radio verilişləri redaksiyasında təşkilatçı vəzifələrində çalışıb.

Onun sonrakı həyatı «**Kənd həyatı**» qəzeti ilə bağlıdır. Həsənalı Bayramov çox sakit kimsə ilə işi olmayan, öz işini bilən bir jurnalist kimi mənim yaddaşıma həkk olunub. Bir dəfə rayon qəzetində redaksiya heyəti tərəfindən təbii ki, raykomun göstərişi ilə bir tənqidi məqalə verilmiş və altında da onun imzası qoyulmuşdu. Bu yazını oxuyanda mən dedim ki, bu Həsənalı Bayramovun işi deyildir. Haqqında yazı verilən adam da bizimlə idi. O da dedi ki, bu onun işi deyildir. Bir neçə gündən sonra aydın oldu ki, məqaləni o yazmayıb. Özlərini pis duruma salmaq istəməyən bəziləri onu pis vəziyyətə salmışdılar. Həsənalı Bayramov rayonda ilk dəfə radio verilişləri yayımlanmağa başlayanda radiomuzun ilk aparıclarından və diktorlarından olub. Biz hələ otra məktəb illərindən onun səsini çox eşitmiş, amma üzünü görməmişdik. Bir dəfə Zəngilan şəhər 1 saylı orta məktəbində bir tədbir keçirilirdi. Gördüm ki, bir nəfər elektrik tellərini ora bura çəkir müxtəlif aparatlara və qurğulara bağlayırdı Əvvəl heç nə anlamadım. Elə ki, tədbir başlandı, bu adam danışmağa başladı, onu səsindən tanıdım..

O mənim üçün Zəngilanın ilk diktoru, aparıcısı, xalq artisti hesab olunur. Sonda onu deyim ki, bu qocaman jurnalist son illərdə, qaçqınlıq dövründə bir tikə çörək qazanmaq üçün nə çətinliklərə düşüb. Belə qələm sahiblərinə görəsən nə vaxt qiymət veriləcək? Allah düşmənə lənət eləsin.

**Bayramov Həsənqulu Camal oğlu**

*Zəngilan (Pirçivan) kənd ZDS İK-nin sədrlərindən*



Bayramov Həsənqulu Camal oğlu 1896-cı ildə Zəngəzur qəzasının Üdgün kəndində anadan olub. Sovet hakimiyyətinin ilk illərindən milisə daxil olan Həsənqulu Bayramov 30–cu illərdə Zəngilan rayon milis idarəsinin rəisi işləmişdir. Uzun illər partiya və sovet orqanlarında çalışan Həsənqulu Bayramov ötən əsin 50-ci illərində təxminən 1958-1962-ci illərdə Pirçivan kənd ZDS İK –nin sədri işləmişdir.

O dəfələrlə müxtəlif mükafatlar, fəxri fərman və pul mükafatı ilə mükafatlandırılıb. Həsənqulu Camal oğlu Bayramov bir neçə çağırış Pirçivan kənd ZDS-nin deputatı seçilib.

Həsənqulu Bayramovun oğlu Şahmar rayonumuzun ilk futbol komandasının qapıçısı olmuşdur. Sonralar partiya və sovet orqanlarında işləmiş, işğaldan sonra Bakı şəhərində vəfat etmişdir.

Həsənqulu Camal oğlu Bayranov işğaldan əvvəl 1993-cü ildə Zəngilan şəhərində vəfat etmişdir.

**Bəxtiyarov Nəriman Şahsuvar oğlu**



Bəxtiyarov Nəriman Şahsuvar oğlu 10 iyun 1931-ci ildə Rayonun Vənətli kənfdində anadan olub. İlk təhsilini kənd məktəbində alan Nəriman Şahsuvar oğlu sonra Gilətağ kənd orta məktəbini biririb.

Orta məktəbi bitirdikdən sonra bir müddət Qubadlı rayonunda çixan «Avanqard» qəzetində işləyib.

Sonra qiyabi olaraq Azərbaycan Dövlət Universitetinin Jurnalistika fakültəsinə daxil olub. Universiteti

bitirdikdən sonra yenə də qəzetdə işini davam etdirmişdir.

1963-cü ildə Zəngilan rayonunda müstəqil «**Kənd həyatı**» qəzeti nəşrə başladlı. Qəzetin redaktoru Mürsəl Qocayev təyin olundu.

Redaktor müavinliyinə isə bir müdət sonra Bəxtiyarov Nəriman Şahsuvar oğlu təyin olunur. Onu qəzetdə redaktor müavini olmaqla bərabər yazdığı felyetonlar məhşurlaşdırdı. Onun o illərdə yazdığı və qəzetdə nəşr olunan «Aşıq Abbas kürd Şahnaz və Dəllək Məmməd», «Prokurorun ələyi Zülfüqarın kələyi», «Məhəmmədəli məşq edir», «Kişi tüpürdüyünü yalamaz» və s. felyetonları yaşlı və orta nəslin xatirindədi.

Bəxtiyarov Nəriman Şahsuvar oğlu 24 iyun 1978-ci ildə yaradıcılığının çiçəkləndiyi bir dövrdə 48 yaşında dünyadan köçdü.

Həyat yoldaşı Hüseynova Sona MİrZə qızı rayonumuzun ziyalı xanımlarından olub. Onların Elbrus (vəfat edib), Vidadi və İldırım adlı üç oğlu var,

## Bəşirov Arif Cəbrayıl oğlu

*Şəhid atası*



Bəşirov Arif Cəbrayıl oğlu 1937- cı ildə Pirçivan kəndində anadan olub. Ilk təhsilini Pirçivan kənd məktəbində alan Arif Bəşirovun həyatı rayon Kino idarəsi ilə bağlı olub. O uzun illər burada kino mexanik işləyib və eyni zamanda da rayona gələn filmlərin ilk reklamçısı yəni afişasını yazan olub.

Onun yazdığı afişalar mənim hər zaman diqqətimi cəlb edərdi. Kino idarəsinin direktorlarından olmuş Asif Bağırovun dediyinə görə o bu müəssisənin əsas simalarından biri idi. Sadəliyi alicənablığı ilə seçilərdi. Arif Bəşirov Zəngilanın futbol komandasının ən yaxşı hücumçularından hesab olunurdu.

Bizim evin yaxınlığında da bir afişa asılan lövhə var idi. Demək olar ki hər gün film başlayandan sonra ora gəlib baxardım. Əgər afişa yerindədisə onu qoparıb evə aparardım.

Arif Cəbrayıl oğlu Bəşirov şəhid atasıdır. Oğlu Fazil 1993-cü il oktyabrın 24-də Cəbrayıl rayonunun Dərzili kəndindən zirehli texnika ilə hücum edən düşmənə qarşı döyüşdə 6 nəfər polis əməkdaşı ilə birlikdə qeyri-müəyyən şəraitdə itkin düşüb.

Bəşirov Arif Cəbrayıl oğlu 11 iyun 1991-ci ildə Zəngilan şəhərində vəfat etmişdir.

## Cəfərov Bəxtiyar Cəfər oğlu



Cəfərov Bəxtiyar Cəfər oğlu 1927-ci ildə Zəngilan rayonunun Qıraq Müşlan kəndində anadan olub. İlk təhsilini Zəngilan kənd məktəbində alan Bəxtiyar 7-ci sinfi bitirdikdən sonra ailə vəziyyəti ilə əlaqədar işləməyə məcbur olmuşdiur. Amma o təhsilini davam etdirməyi də unutmayaraq qiyabi axşam fəhlə-gənclər məktəbində orta təhsil almışdır.

O illərdə çoxları ailə vəziyyətinin ağırlığı səbəbindən gənc yaşlarından əmək fəaliyyətinə başlardılar. Sovet hakimiyyətinin ilk illərindən etibarən rayon mərkəzlərini elektrik enerjisi ilə təmin etmək üçün ilk SES-lər tikilməyə başladı. Rayonda bu məqsədlə «Çeşməgözü» deyilən yerdən kanal çəkilmiş və onun keçdiyi yerlərdə kiçik SES-lər tikilməyə başlamışdı. Pirçivan kəndindən sonra belə bir SES-kanalın keçdiyi Qıraq Müşlan kəndinin ərazisində tikilir.

Adətən bu işlərə mütəxəssislər yerli gənclərdən dəvət edər işlədərdilər. Gənc Bəxtiyar da SES- in tikintisində işləməyə başlayır. Mərkəzdən gələn mütəxəssislərlə bərabər işləyən Bəxtiyar Cəfər oğlu tezliklə bu işin sirrlərinə vaqif olduğunu göstərmişdir. Onun ağlını, fərasətini, bacarığını görən mütəxəssilər yerli

rəhbərliyin də razılığı ilə 5 kəndi əhatə edən sovetliyə elektirik enerjisi verilməsi işini  ona həvalə etmişlər. Bu kəndlər Zəngilan, Məlikli, İçəri Müşlan, Qıraq Müşlan və Üdgün idi. Mexanizmdən xüsusilə də elektrik avadanlıqlarından yaxşı anlayan Cəfərov Bəxtiyar Cəfər oğlu eyni zamanda kənd təsərrüfatının digər sahələrində mexanilkləşdirmədə fəal iştirak etmiş kolxozlara yaxından köməklik göstərmişdir.

Cəfərov Bəxtiyar Cəfər oğlunun istedad və bacarığını görən rəhbərlik onu Ağdam kənd təsərrüfatı texnikumuna oxumağa yollamışlar. O burada elektrik avadanlıqlarının istismarı fakültəsində qiyabi təhsil almışdır.

O illərdə belə mütəxəssislərə ehtiyac çox idi. Onun 21 yaşı olmasına baxmayaraq rayon İşıq idarəsinə rəis təyin etmişlər.

Cəfərov Bəxtiyar Cəfər oğlu uzun illər bu müəssisəyə rəhbərlik etmişdir. 70-80- ci illərdə onun adı nümunəvi işinə görə tez tez hallanardı. O öz peşəsini bilən yaxşı kadrlarımızdan idi. Uzun illər qüsursuz xidmətlərinə görə dəfələrlə «Fəxri Fərman», Sosializm yarışının qalibi, Nazirliyin əlaşı energetik döş nişanı   ilə təltif edilmişdir. O bir neçə çağırış  həm şəhər, həm də ki, rayon XDS-nin deputatı seçilib. O eyni zamanda istehsalatdan ayrılmadan ali təhsil də alıb.

Cəfərov Bəxtiyar Cəfər oğlunu 1975-ci ildə geridə qalan Kommunal Müəssisələri Kombinatına direktor təyin edirlər. Bu təşkilat da şəhərimizin abadlığı ilə birbaşa məsuldur. O burada da özüünü bacarıqlı kadr kimi göstərmiş tez bir zamanda müəssisəni qabaqcıllar sırasına çıxarmış, şəhərimizin abadlaşdırılmasında fədakarlıq etmişdir.

Rayonda bilirsiniz ki, ən çox ehtiyac duyulan sahələrdən biri də enerji problemidi. Xüsusən də qış aylarında güclü külək və yağış üzündən dirəklər yerindən qopar, elektrik naqilləri qırılıb tökülərdi.

Rayon rəhbərliyi onu təcrübəli energetik kimi yenidən öz ixtisası olan sahəyə rayon elektrik şəbəkəsinə rəis təyin etdi.

Cəfərov Bəxtiyar Cəfər oğlu təqaüdə çıxana kimi bu idarəyə rəhbərlik etmiş, təqaüdə çıxdıqdan sonra da həmin idarədə kadrlar şöbəsinin müdiri işləmişdir.

Rayonun işğalı bir çoxumuz kimi ona da böyük mənəvi zərbə vurdu. Bununla barışmaq vətən oğullarına ağır gəlsə də səbr etməkdən başqa çarəmiz yox idi. Onun 4 övladı var. Onları da vətənə məhəbbət ruhunda tərbiyə etmişdir.

Cəfərov Bəxtiyar Cəfər oğlu 2008- ci ilin 29- aprelində uzun sürən xəstəlikdən sonra dünyasın dəyişib. Allah rəhmət eləsin.

### Cəfərov Alı Mirzəxan oğlu

*həkim*



Cəfərov Alı Mirzəxan oğlu 08 fevral 1929-cu ildə Zəngilan rayonunun Qıraq Müşlan kəndində anadan olub. Ailədə 4 qardaş, bir bacı olublar. O 1945-ci ildə kənd Zəngilan orta məktəbini bitirib və həmin il Azərbaycan Dövlət Tibb İnstitutunun müalicə-profilaktika fakultəsinə daxil olub.

Cəfərov Alı Mirzəxan oğlu 1953-cü ildə həmin institutu bitirib və təyinat üzrə Türkmənistan respulikasının Krasnovodsk şəhərinin Qızılsu qəsəbə xəstəxanasına göndərilib. Alı Mirzəxan oğlu 3 il orada həkim kimi əmək fəaliyətinə başlayıb.

Oradakı təyinat müddəti bitəndən sonra Azərbaycana qayıdan Alı həkim 1956-1959-cu illərdə Zəngilan rayonunun Mincivan qəsəbə Dəmiryol xəstəxanasında həkim kimi fəaliyyətini davam etdirir.

Cəfərov Alı Mirzəxan oğlu 1960-cı ildən rayonumuzun işğalına qədər Zəngilan rayon Mərkəzi xəstəxanasının vərəm dispanserinin baş həkimi işləyib. Eşitdiyimə görə Cəfərov Alı Mirzəxan oğlu yüzlərlə zəngilanlını vərəmdən xilas edib.

Cəfərov Alı Mirzəxan oğlu 2001-ci ildə Bakı şəhərində rəhmətə gedib.

Həyat yoldaşı Cəfərova Məryəm Zinnətulla qızı 1930-cu anadan olub, milliyyətçə tatar idi, 2006-cı ildə Bakı şəhərində vəfat etmişdir. Onların 3 qızı bir oğlu var.

-qızı Adilə 1954-cü ildə anadan olub, həyat yoldaşı rəhmətə gedib. Bakı şəhərində yaşayır, 3 qızı, 8 nəvəsi var. Təqaüddçüdür.

-qızı Əlfiyyə 1957-ci ildə anadan olub. Bakı şəhərində yaşayır. Müəllimədir. Evlidir, 2 oğlu, 2 nəvəsi var.

-oğlu Nazim 1958-cidə anadan olub, Bakı şəhərində yaşayır. Neft mühəndisidir. Evlidir, iki övladı, 1 nəvəsi var.

-qızı Aidə 1960-cı ildə anadan olub. Bakı şəhərində yaşayır. Əczaçıdır. Evlidir, 2 qızı, 1 nəvəsi var.

***

Zəngilanın canlı ensiklopediyası, mahir qarmon ifaçısı, muğam bilicisi, pedaqoq, bu gün həyatda mənim ən çox inandığım, sözünə etibar etdiyim, eyni zamanda da məni bu dünyada anlayan və başa düşən Asif Bağırov Alı həkim barədə deyir:

-Alı həkimin özü boyda da ürəyi var idi.

Alı həkimi böyük qardaşım Şamı ilə 50 illik sınaqdan çıxmış əsil dostluq bağlayırdı. Alı həkimin əmisi Məmiş Cəfərov Pirçivandakı M.C.Bağırov adına kolxozun sədri, Şamı isə baş mühasibi idi. Keçən əsrin 50 -ci illərində Məmiş dayının böyük oğlu Bakıda DİŞ orqanlarında müstəntiq işləyən Rəsul rayona gələndə Şamı ilə otu-dur edərdi. Onlar bizim dolayı evdə otururdular, süfrə salınardı. Məmiş dayının Xanoğlan, Zöhrab adlı daha iki oğlu, Hürü adlı da bir qızı var idi.

Alı həkim ilə Şamının dostluğu da elə o illərdən başlamışdı. O ailəmizin yaxın adamlarından sayılırdı. Olduqca sadə və zarafatcıl idi. Elin-obanın xeyir-şərinə yarayan bir şəxsiyyət kimi ad qazanmışdı. Alı həkim çox vaxt Şamı ilə dostluq eləyən Əmiraslan Cahangirov və Mürvət Abbasovla oturub durardı. Zəngilan şəhərində hamı onların baməzə söhbətlərindən və şən zarafatla-

rından danışardı.

Zəngilan şəhərinin ən səfalı, əyləncəli istirahət yeri sayılan «Lenin bağı»nda yaz-yay aylarında Alı həkim harada oturardısa hamı istəyirdi ki, ona yaxın yerlərdə əyləşsinlər. Ona sataşanlar da onun cavabından həzz alardılar. O böyük insanın toylarda çox gözəl, həm də qıvraq rəqs etməyi var idi.

Musiqiçi kimi iştirak etdiyim toylarda Alı həkimə söz verəndə, ya da rəqs edəndə mən toybaşıya (çox zaman toybaşı montyor Ağayev Nəriman olardı) xəlvətcə bir onluq verərdim. O da oynaya-oynaya onu Alı həkim əgər pencəkdə isə pencəyinin yan cibinə, yaxud köynəkli isə köynəyinin döş cibinə ustalıqla qoyardı. O məni doğma bildiyi üçün bu jestə etiraz etməzdi.

Onun həm sakit, həm də tərbiyəli bir oğlu, üç qızı var. Övladlarının hamısının toyunda musiqıçi kimi məni görmək istəyirdi. İki qızının toyunda iştirak elədim. Aidənin toyunda isə oğlan evinə əvvəlcədən söz verdiyimdən iştirak edə bilmədim. Oğlunun toyunda isə başqa yerə söz vermişdim. Az müddətdə məndən incik qalsada onu görəndə üzündən öpüb üzr istərdim. O da məni bağışlardı. O Şamını böyük qardaş bildiyi kimi, məni də c kiçik qardaş sayardı.

Qızı Əlfiyə xanım mənimlə bir yerdə işləyəndə Pionerlər Evinin həyətində əkmək üçün bir ədəd salxım söyüd və xeyli sayda gül-çiçək toxumu gətirmişdi. Onları əkdik. Onlar Pionerlər evinə xüsusi gözəllik verirdi. Əgər indi o ağac qalırsa 45 dən yuxarı yaşı var.

Zəngilanın işğalı Alı həkim üçün ikiqat faciə idi. Bu haqda söz açmaq istəməzdim.

Biz İranda 1993-cü ilin oktyabr ayının 27-də Araz qırağında Alı həkimlə görüşdük. Onu köməkləşib Kamaz tipində bir İran maşınınn kuzovuna mindirdik. Alı həklim Atışı (Quliyev Rafiq Vəli oğlu) maşının yanına çağırdı. O, onun orada kimsəsiz qalmasını istəmirdi. Bu hal indi də gözümün qabağındadı və xatırlayanda kövrəlirəm.

Sonra biz Alı həkimlə Bakıda hüzr yerində görüşdük. Bir az sınıxmışdı. O mənim bikefliyimi hiss edib:

-Deyəsən arıqlamışam, dedi.

O dünyasın dəyişəndə üzürlü səbəbdən orada iştirak edə bilmədim.

Alı həkim zəngilanlıların qəlbində əbədi yaşayan bir şəxsiyyətdir. Onun yoxluğu mənim üçün bir böyük itkidir.

**Cəbrayılova Zoya Hüseyn qızı**

*Rayon komsomol komitəsinin I katiblərindən*



Zoya Hüseyin qızı Cəbrayılova 1964-cü ildə Zəngilan rayonunun İçəri Müşlan kəndində anadan olmuşdur. Orta məktəbi bitirdikdən sonra 1981-ci ildə M.F. Axundov adına Azərbaycan Dövlət Pedoqoji Rus dili və Ədəbiyyatı İnstitutuna daxil olmuş 1986-cı ildə isə həmin İnstitutu fərqlənmə diplomu ilə bitirmişdir. 1986-1987-ci illərdə o S. Qardaşov adına İçəri Müşlan kənd məktəbində rus dili və ədəbiyyatı müəllimi kimi əmək fəaliyyətinə başlamışdır. 1988–ci ilin yanvarında onu Zəngilan Rayon Komsomol Komitəsinin birinci katibi vəzifəsinə seçirlər. Sovet hökümətinin 1990-cı ilin 20 yanvarında xalqımıza qarşı törətdiyi qanlı hadisələrə etiraz əlaməti olaraq partiya biletini atmış, və vəzifəsindən istefa vermişdir. 1990-1992-ci illərdə yenidən öz peşəsinə qayıdan Zoya xanım Vəli Quliyev adına Zəngilan kənd orta məktəbində əmək fəaliyyətini davam etdirmişdir. 1992-1996-cı illərdə o, Zəngilan rayon İcra Hakimiyyəti başçısının humanitar məsələlər üzrə müavini olmuşdur. 1996-cı ildən 2001-ci ilin sentyabrina kimi Baki Slavyan Universitetində Türkologiya kafedrasında baş laborant sonra isə müəllimə vəzifəsində işləmişdir. 1998-ci ildə Azərbaycan Respublikasının Prezidenti yanında

Dövıət İdarəçilik Akademiyyasına daxil olmuş və 2001-ci ildə həmin akademiyanı fərqlənmə diplomu ilə bitirmişdir. (2006-ci ildə yazılıb)

**Cəbrayılov Sərdar Firid oğlu**

*Rayon mədəniyyət şöbəsinin müdiri*



Cəbrayılov Sərdar Firid oğlu 1937-ci ildə Zəngilan rayonunun Cahangirbəyli kəndində anadan olmuşdur. 1956-cı ildə Mincivan kənd orta məktəbini bitirdikdən sonra hərbi xidmətə getmişdir. O vaxtlar biz gənclər hamımız xidmət etdiyimiz bu ordunu xilaskar, sülhün dayağı kimi tanıyırdıq, çünkü o belə təbliğ olunurdu. Əslində isə o ordu çox qəddar, zalım və qan tökməkdə mahir bir imperiyanın mənafeyini qoruyan bir qurum idi. Hərbi xidmətdən qayıtdıqdan sonra Sərdar Firid oğlu Naxçıvan şəhərində, Mincivan qəsəbəsində və Bakıda gözətçi, poçt işçisi və poladəridən peşələrində işləmişdir.

1965-ci ildə o, zaman ki Azərbaycan Dövlət Universitetinin Kitabxanaçılıq fakultəsinə qəbul olunmuş və 1970-ci ildə oranı bitirmişdir. 1971-1977-ci illərdə Cahangirbəyli kənd XDS İcraiyyə Komtəsinin sədri olmuşdur. 1978-ci ildə Sərdar müəllim rayon mərkəzləşdirilmiş kitabxana siteminə direktor təyin olunur. 1990-cı ilin 20 yanvar hadisələrindən sonra Zəngilan rayonunda da mövcud rejimə, kommunist partiyasına, onun rəhbəri Qorbaçova qarşı narazılıqlar, nümayişlər, siyasi hərəkatlar başlandı. Bu hərəkatın təşkilatçılarından biri də Sərdar müəllim idi. 1992-ci ildə onu rayon Mədəniyyət şöbəsinə müdir təyin etdilər. O ömrünün sonuna kimi bu vəzifədə işlədi.

Cəbrayılov Sərdar Firid oğlu 16 fevral 2009-cu ildə vəfat etmişdir.

## Əhmədov Tofiq Əli oğlu



**Əhmədov Tofiq Əli oğlu** (10 aprel 1938, Zəngilan rayonu - 8 avqust 1981)- Bakı Zərgərlik Zavodunun Direktoru, SSRİ zərgərlik zavodları şurasının sədri.

Tofiq Əhmədov 10.04.1938-ci ildə Zəngilan (Pirçivan) rayonunda anadan olmuşdur. Orta məktəbi orada bitirib 1955-ci ildə Bakı şəhərində Neft-Kimya (AZİ) institutunda axşam şöbəsində oxuyaraq eyni zamanda Leytinant Şmidt zavodunda fəhlə işləmişdir. Təhsilini başa vurduqdan sonra Sumqayıt şəhərinə Neft və Kimya Sənayesinin Avtomatlaşdırılması ETİ-na təyinatla mühəndis kimi göndərilmiş və pillə-pillə vəzifəsi artaraq 1965-ci ildə Bakı şəhərində Kalinin adına maşınqayırma zavoduna direktor təyin edilmişdir.

1971-ci ildə, Ulu Öndər Heydər Əliyevin zərgər dəqiqliyi və daxili intiusiyası ilə seçdiyi kadrlardan biri də Tofiq Əhmədov idi.1971-ci ildən 1981-ci ilə kimi(ömrünün sonuna qədər) Bakı Zərgərlik zavodunda direktor işləmişdir.

Fəaliyyətinə verilən qiymətlər içində iki dəfə «Qırmızı Əmək Bayrağı»ordeni,«cihazqayırma əlaçısı»nişanı və digər medal və nişanlarla təltif edilməsi, SSRİ zərgərlik zavodları şurasının sədri (respublikaların sayına uyğun 14 zavod) təyin edilməsi, bir neçə çağırış Bakı Şəhər Sovetinə deputat seçilməsi nəzərə çarpır.

Zərgərlik fabrikinin böyük zavoda çevrilməsi, Avropa ölkələrindən olan İtalya ilə əməkdaşlıq H. Əliyevin köməyi və T. Əhmədovun əməyi nəticəsində mümkün olmuşdur.

T. Əhmədov 8.08.1981-ci ildə qısa sürən xəstəlik nəticəsində (kəskin qara ciyər-böyrək çatışmamazlığı) dünyasını xəstəxanada dəyişmişdir. Həyat yoldaşı Gülarə xanımdı. Onların üç qız övladı və nəvələri var.

**Əhmədov Zülfü Şahvələd oğlu**

*Xeyirxah əməllər sahibi, el-oba atası*



Onu tanıdığım vaxtdan 40 ilə yaxın bir dövr keçsə də ilk dəfə necə görmüşdümsə o yaraşığı, o gümrahlığı dünyasını dəyişən günədək eləcə də saxlamışdı. Dəyişən onun el-oba adamlarının yolunda çəkdiyi əziyyətlərin ölçüyə gəlməzliyi, qazandığı savabların üstünə yenilərinin gəlməsi idi. Bu, Zülfü Şahvələd oğlu Əhmədov idi.

O, 1912-ci ildə Zəngəzur qəzasının Ağbis kəndində yoxsul ailədə anadan olmuşdu. Zəngilan və Qubadlı rayonları dəfələrlə birləşib ayrılsa da əkiz qardaş sayılan, adət-ənənələri eyni olan bu rayonların insanlarının mehribançılığına, istiqanlılığına xələl gəlməmiş, əksinə daha da doğmalaşmışlar.

Zülfü dayı 5 yaşında ikən atasını itirmiş, anasının himayəsində böyümüşdür. O, 9 yaşından 13 yaşınadək kəndlərində xüsusi təsərrüfatla məşğul olmuşdur. 1925-1930-cu illərdə balaca Zülfü Sarallı Xəştab kəndindəki ibtidai məktəbdə təhsil almış, bir ay təkmilləşdirmə kursunda oxuduqdan sonra 1930-1931-ci illərdə Muradxanlı kəndində Cavanlar məktəbində tələbə olmuş, 1932-1935-ci illərdə Ağdam pedaqoji texnikumunda oxumuşdur. O, 1935-1939-cu illərdə Ağbis kəndindəki kolxozda hesabdar işləmiş, 1937-ci ildə Şuşa şəhərindəki 6 aylıq hesabdarlıq kursunu da bitirmişdir. Zülfü Əhmədovun gələcək əmək fəaliyyətinin 50 ilini müxtəlif rayonlarda rəhbər partiya işində mühüm vəzifələr təşkil edir. O, 1939-cu ilin dekabr ayından Qubadlı rayon partiya komitəsində təşkilat və kadrlar şöbəsinin müdiri vəzifəsinə keçməklə bütün ömrünü partiya həyatı ilə bağlamışdır. 1940-cı ilin mart ayında kommunist partiyası sıralarına qəbul olunan Zülfü Əhmədov elə həmin ildə də anasını itirmişdir. İki bacının yeganə

qardaşı olan Zülfü dayı yaşca özündən böyük olan bacıları və onların övladlarının da qayğısını çəkməli olmuşdur. Zülfü dayının 1900-cü il təvəllüdlü Ölkə adlı bacısı 1942-ci ildə, onun əri Kərbəlayi Mehralı isə 1943-cü ildə dünyalarını dəyişmişlər. Onların yetim qalan uşaqları Abbasəli, Cəlal, Dilarə, İslam və Camal Zülfü dayının himayəsində böyümüş, onların toylarını da o etmişdir.

Zülfü Əhmədovun partiya işindəki estafeti Qubadlı, Bərdə və Zəngilan rayonlarını əhatə edir. Onun vəzifəsindən ayrılmadan təhsilini davam etdirdiyi məktəblərin siyahısına fikir verək: Azərbaycan LKGİ MK yanında rəhbər təbliğat işi aparan altı aylıq kurs, APİ-nin tarix fakültəsi, Bakı şəhərindəki iki illik partiya məktəbi, Azərbaycan KP MK yanındakı rəhbər kadrlar hazırlayan altı aylıq kurs.

Göründüyü kimi Z.Əhmədov rəhbər partiya kadrları üçün tələb olunan mükəmməl biliyi vaxtında əldə edə bilmişdir.

Z.Əhmədovun Zəngilan rayonuna partiya işinə ilk gəlişi 1943-1944-cü illərə təsadüf etsə də o, yenidən Qubadlıya partiya vəzifəsinə qaytarılır. Zülfü dayı 1952-ci ilin iyul ayından bütün ömrünü Zəngilana bağlayır. Müxtəlif illərdə rəhbər partiya vəzifəsində işləyən Z.Əhmədov həmçinin Bərdə, Qubadlı və Zəngilan rayonlarında büro və plenum üzvü seçilmişdir. Hər üç rayonda o dövrün ən mühüm vəzifələri sayılan MTS-lər üzrə siyasi müavin vəzifələrində işləyən Z.Əhmədov həm də kadr üzrə katib (yəni, II katib) vəzifələrində də çalışmışdır. O, İkinci Dünya Müharibəsi illərində arxa cəbhədəki fədakar əməyinə görə «Qafqazın müdafiəsi» və «Almaniya üzərində qələbə» medalları ilə təltif edilmiş, 1942-ci ilin fevral ayında dövlət tapşırığını yerinə yetirmək üçün kapitan rütbəsində Təbriz şəhərində xüsusi ezamiyyətdə olmuşdur. İşlədiyi dövr ərzində Z.Əhmədov rayon və şəhər sovetlərinin deputatı seçilmiş, «Arxa cəbhə veteranı» döş nişanı, «Lenin yubiley medalı», «Şərəf Nişanı» Ordeni ilə təltif edilmiş, «Sosializm yarışının qalibi» adına layiq görülmüşdür. O, həmçinin respublika və rayon rəhbərliyinin bir sıra «Fəxri Fərman»ları ilə

təltif olunmuşdur. Onun ən çox apardığı vəzifələrdən biri Siyasi Maarif kabinetinin müdirliyi və «Bilik Cəmiyyəti»nin sədri vəzifələridir. Zülfü Əhmədov bir müddət Zəngilan Rayon İcraiyyə Komitəsi sədrinin müavini və rayon Yağ-pendir İdarəsinin müdiri vəzifələrində də çalışmışdır. O, 1991-ci ildə dövlət qulluğu təqaüdünə çıxmışdır.

Zülfü dayının ən böyük mükafatı el-obanın, qohum-əqrəbanın ona verdiyi yüksək qiymətdir. O, bunu vaxtında köməyə çatan xeyirxahlığı sayəsində qazanmışdır. SSRİ-nin paytaxtı Moskva şəhəri olan kimi Zülfü dayının da evi el-oba, dost-tanış tərəfindən paytaxt kimi sayılmışdır. Onun kömək elədiyi, dadına çatdığı insanların dəqiq siyahısını hesablamaq çox çətindir. Zəngilanın Ağbis, Ağakişilər, Sarallı Xəştab, Quyu-dərə Xəştab, Yeməzli, Fərəcbəyli, İsgəndərbəyli və digər kəndlərinin sakinləri Zülfü dayını həmişə özlərinin ağsaqqalı və məsləhət yeri bilmiş, Zəngilanın mərkəzində yaşayış və iş üçün bir qayda olaraq ona müraciət etmiş, yorulmaq bilməyən bu təəssübkeş insanın köməyi sayəsində istəklərinə nail olmuşlar. Zəngilanda və ondan kənarda mühüm vəzifələrdə işləyən şəxslərin bacarığı ilə yanaşı Zülfü dayının himayədarlığı və təkanının da böyük rolu danılmazdır. Zülfü dayı bu missiyanı öz nüfuzu və xahişi ilə təmənnasız olaraq yerinə yetirmişdir. Belə işlərinə görə Zəngilanda və Qubadlıda kara gələn kişilərdən söhbət düşəndə ilk adı çəkilənlərdən biri də Zülfü Əhmədov olmuşdur. Köhnə kişilərin hamısı Zülfü dayının adını Azərbaycanın korifeyləri Kamran Hüseynov, Süleyman Rəhimov, Əli Vəliyev, Nəzər Heydərov, Məmməd İsgəndərov kimi tarixi şəxslərlə bir sırada çəkirdilər. Həmin insanlarla Zülfü dayının sıx əlaqələri və yaxın dostluğu olmuşdur.

Zəngilanda jurnalistikanın təməl daşını qoyan, Zülfü dayının böyük bacısı Abuhəyat xanımın oğlu Mürsəl Qocayevin xatirələrindən:

«Dayım Zülfü Əhmədov Bakıya partiya məktəbinə kursa gəlmişdi. Bir dəfə Ə.Vəliyevin «Cəbhə hekayələri» kitabını əlimdə

görüb dedi:

-Yaxşı eləyib oxuyursan. Sözübütöv kişidir, təəssübkeşdir. Onunla görüşəndə adama xoş təsir bağışlayır. Dayımın onu yaxşı tanıdığını eşidib xeyli sevindim, ürəyimdə arzu etdiyim bu söz dilimə gəldi:

«Kaş onu görəydim!» Bunu eşidən dayım dedi:

-Mən Bakıya gələndə həmişə onunla görüşürəm. Bu günlərdə onun evinə getməliyəm, şəxsi işim var. Onda səni də apararam».

Bir istirahət günü dayımın yanına getdim. Birlikdə onun (o zaman yaşadığı ünvan Çkalov 15 idi) evinə getdik. Ucqar bir dağ kəndi uşağı kimi o zaman nə yazıçı, nə şair görmüşdüm, nə də alim. Bütün həmyaşıdlarım kimi onları az qala qeyri-adi adam kimi təsəvvür edirdim.

Otağa daxil olanda ev paltarında bir kişi stolun üstündə banka ilə gimrik duz əzirdi. İlk baxışda onu bizim kəndimizdə olan kişilərə oxşadırdım. Əkinçilərə məxsus iri əlləri, qalın, sıx və uzun tüklü qaşları, səsində isə bənzərini tapa bilmədiyim bir ahəng var idi».

**Hacı Əli Sobulunun** «Əbədiyaşar Mürsəl Qocayev» **kitabından, s.72**

«Sözübütöv kişidir, təəssübkeşdir» cümləsi elə Zülfü dayının özünə də aid deyilmi? (Asif Bağırov)

İnamla bildirirəm ki, Mürsəl müəllimin mükəmməl bir şəxsiyyət kimi formalaşmasında Zülfü dayının da xeyli rolu olmuşdur.

Özüm şahidi olduğum bir hadisə. Tələbə idim. Əvvəllər Azərbaycan. KP MK-da şöbə müdiri işləmiş tarix elmləri namizədi, əslən Gəncədən olan, çox ciddi və tələbkar, dolu bədənli, qırmızı yanaqlı İlyas Bağırov adlı bir müəllim bizə mühazirə oxuyurdu. Qış semestrində Orta əsrlər tarixindən ona imtahan verəcəkdik. Yuxarı kurs tələbələrindən eşitmişdik ki, çox təmiz insandır. Biliyi olmayan «əmili», «dayılı» tələbələri kursda saxlamışdır. Yeganə çıxış yolu imtahana hazırlıqlı gəlmək, onun suallarına

qənaətləndirici cavablar verməkdir. Heç vaxt kəsirim olmasa da daxilən qorxu hissi keçirirdim. Üstəlik institutda nə «dayım», nə də «əmim» var idi. Yay semestri olsa da canımı qış soyuğu almışdı. Birdən qapı döyüldü, qapıdakı Zülfü dayı idi. İlyas müəllim onu görən kimi yüyürərək qucaqlayıb bağrına basdı. Foyedə 2-3 dəqiqə söhbət edəndən sonra içəri qayıdıb Zülfü dayı barəsində:

-«Bu kişi əslən Qubadlı rayonundandır, indi Zəngilanda işləyir, iyirmi beş ildən çoxdur ki, dostuq, qardaşıq. Adı və familyası Zülfü Əhmədov olsa da ona həmişə Şor Çörəyov deyərdim. Mərkəzi Komitədə işləyərkən Qubadlı rayonuna getmişdim. Müharibə illəriydi. Zülfü II katib işləyirdi. Bizə yemək hazırlamışdılar, bitki yağı ilə bişirildiyindən xoşagəlməz iyisinə görə yeyə bilmədik. Zülfü gedib evlərindən şor və çörək gətirdi, çox iştaha ilə yedik və o gündən mən onu «Şor Çörəyov» adlandırdım».

-Mən artıq qış semestrinə lap «yay havasında» gəlmişdim. Bəd ayaqda Şor Çörəyovun qohumu olduğumu deyəcəkdim təzəcə danışmağa başlamışdım ki, İlyas müəllim qiymət kitabçama «yaxşı» yazaraq:

-Ayə, biz əmioğlu imişik ki, dedi və sifətində təbəssüm göründü:

Çox sevindim, Zülfü dayını bir mənəvi dayaq bildim.

Zülfü dayının xeyirxahlığı haqqında başqa bir misal:

Qonşuluğumda altı qızı, bir oğlu olan bir kişinin yeganə oğlunu Bakı şəhərində dolaşdırmışdılar. Bir nəfər kişidən 8 min manat alaraq oğlunu həbsdən qurtaracağına söz vermiş və həmin pulu mənimsəmişdi. Zuğulbaya sanatoriyaya putyovka alan Zülfü dayı bu işi təxirə salıb kişinin yeganə oğlunu həbsdən qurtamışdı. Bu hadisəni elə həmin kişinin özü mənə danışmışdı.

Zülfü dayı belə bir kişi idi. Respublikada yüzlərlə etibarlı dostu və tanışı olan Zülfü dayı, əlbəttə, Bakı şəhərində münasib ev və vəzifə də ala bilərdi, lakin Zəngilanda onun köməyinə və himayəsinə ehtiyacı olan insanları başsız qoymadı. Zülfü dayının ömürgün yoldaşı Fatma xala da öz təmkini, xeyirxahlığı ilə Zəngilanda

sayılan, seçilən xanımlardan biri idi. Mən hələ kiçik yaşlarımdan, məktəbdə oxuduğum illərdən Zülfü dayının evini qonaqlı-qaralı görmüşdüm. Bir çoxları Pirçivan kənd məktəbində oxuyarkən onlarda qalırdılar. Bu Pirçivan Zəngilan qəsəbəsi, Zəngilan şəhəri adını alanda da davam edirdi. Fatma xala bu illər ərzində o adamlara anaları qədər doğma idi. Doğrusu hər bir adamda belə geniş ürəkliyi, can yanğısı ilə yanaşmanı görmək elə də asan deyildi.

Zülfü dayının evi onun və Fatma xanımın simasında bir tərbiyə, bir xeyirxahlıq məktəbi idi, həm övladları, həm də qohum-əqrəbaları bu məktəbdən lazımınca bəhrələnirdilər. Onun ailəsində uşaqları ilə bir yerdə böyüyənlərin əksəriyyəti mükəmməl təhsil və tərbiyə ilə yanaşı istər Zəngilanda, istərsə də başqa şəhərdə işlədikləri məsuliyyətli vəzifələrdə böyük hörmət qazanmışdılar.

Zülfü dayı və Fatma xala Azərbaycan dilinə və mentalitetinə hörmət əlaməti ilə yanaşaraq övladlarına valideynlərə müraciətdə «ata», «ana» kəlimələrini öyrətmişdilər. Mən yaşlı bir ziyalı kimi o dövrə qədər heç bir ailədə belə müraciət eşitməmişdim. Ailəmizdə belə müraciəti övladlarımıza, övladlarımız da öz övladlarına «ata», «ana»-deməsinin səbəbkarları Zülfü dayı və Fatma xaladır. Yerləri behiştlik olsun!

Zülfü dayının oğlanları Kamil və Rafael də ailələrinə uyğun yerdən evlənmişdilər. Həm Ramilə, həm də Nailə xanımın ataları halallıqla yaşayan zəhmətsevər insan idi, onları yaxından tanıyırdım. Evin böyük qızı Elmira xanım Təvəkkül müəllimlə, kiçik qızı Rahilə xanım isə Nadir müəllimlə xoşbəxt ailə həyatı qurublar. Hər iki yeznə Zülfü dayını ata, Fatma xalanı isə ana hesab etmişlər. Zülfü dayının və Fatma xalanın xeyirxahlığı onların övladlarına Böyük Yaradan tərəfindən vəfalı və ləyaqətli ömür-gün yoldaşları qismət eləmişdi.

1993-cü ilin avqust ayında Zülfü dayı əbədi olaraq gözlərini yumdu. Çox qarma-qarışıq vaxt idi.

Zəngilanın doğma qardaşı sayılan Qubadlı əldən getmək

ərəfəsində, Zəngilan isə növbəti işğal hədəfindəydi. Buna baxmayaraq, minlərlə insan Zülfü dayı ilə vida görüşünə gəlmişdi. Bakıdan, Sumqayıtdan, digər şəhər və rayonlardan gələnlərin ardı-arası kəsilmək bilmirdi.

Orada yaxından iştirak etdiyimə görə bunları öz gözümlə görmüşdüm. Zülfü Əhmədov xalq üçün, dövlət üçün yaşayan bir insan idi. Bu ilin mart ayında onun 110 yaşı tamam oldu. Sağlığında böyük bir nüfuz sahibi kimi yaşadı. Dünyasını dəyişəndə isə son mənzilə çox böyük hörmətlə yola salındı. Belə şəxsiyyətləri heç zaman yaddan çıxarmaq, unutmaq olmaz. Gələcəyimiz olan bugünki gənclərimiz Zülfü dayının keçdiyi şərəfli ömür yolunu bilməli, belə estafeti davam etdirməlidirlər.

Zülfü dayıya rəhmət diləyirəm. Qəbri nurla dolsun!

**Asif Bağırov-yazıçı-publisist. Bakı şəhəri, 30 iyun 2022-ci il**

**Ələkbərova Gülarə İsfəndiyar qızı**

*Rayon Komsomol Komitəsinin I katiblərindən*



Ələkbərova Gülarə İsfəndiyar qızı 1942-ci ildə rayonun Yuxarı Genlik kəndində anadan olub. 1960 –ci ildə Zəngilan qəsəbə orta məktəbini bitirdikdən sonra rayonda açılan pedaqoji kusu bitirib. Sonra o 1964-1969- cu illərdə o vaxtkı V.I.Lenin adına Azərbaycan Pedaqoji İnstitutunun İbtidai təhsil medodikası fakültəsində oxuyub və oranı bitirib. Bu arada Gülarə İsfəndiyar qızı 1964-1969-cu illərdə rayon Komsomol Komiytəsinin II katibi işləyib. Sonra isə ona böyük etimad göstərilmiş və rayon Komsomol Komitəsinin I katibi seçilmişdir. O bu vəzifədə 1973- cü ilə kimi işlədi. Sonra Gülarə xanım 1973-1975- ci illərdə Bakı Ali Partiya məktəbində oxumuşdur. Məktəbi bitirdikdən sonra onu rayon Partiya Komitəsinə təlimatçı qəbul etdilər.

1976- cı ildən pedaqoji fəaliyyətə keçən Gülarə Ələkbərova 1976- 1993- cü illərdə şəhər səkkizillik məktəbinin direktoru işləyib.

Rayonun işğalından sonra Bakı şəhərində məskunlaşan Gülarə xanım burada 1994-2011-ci illərdə N.Nərimanov rayonundakı İ.Hacıyev adına Tərəqqi Litseyində müəllimlik etmişdir.

Gülarə xanım Lenin Yubiley medalı, Azərbaycan LKGİ MK-nın və Zəngilan rayon Partiya Komitəsinin «Fəxri Fərman»ları ilə təltif olunub.

Ələkbərova Güllarə İsfəndiyar qızı mart 2023- cü ildə dünyasını dəyişib

**Əsədov Dağbəyi Nəriman oğlu**



Əsədov Dağbəyi Nəriman oğlu 26 iyul 1953-cü ildə Zəngilan rayonunun Ağakişilər kəndində anadan olub. İbtidai təhsilini kənd məktəbində alan Dağbəyi sonra Qubadlı rayonunun  Boynakar kənd 8 -illik məktəbində oxumuşdur. Sonra isə Sumqayıt şəhərinə gedərək oradakı 16 saylı orta məktəbi bitirmişdir. Orta məktəbi bitirdikdən sonra rayona qayıtmış və 1971-1973-cü illərdə İskəndərbəyli kənd klubunun müdiri işləmişdir. Əsədov Dağbəyi Nəriman oğlu 1972-ci ildə Kirovabad (indiki Gəncə) şəhərindəki S.Ağamalıoğlu adına Kənd Təsərrüfatı İnstitutuna qəbul olunmuşdur. 1973-1975-ci illərdə Sovet Ordusu sıralarına çağırılan Dağbəyi hərbi xidmətini Leninqrad vilayətində keçirmişdir.

Hərbi xidmətini başa vurduqdan sonra təhsilini davam etdirmiş və 1979 -cu ildə ali məktəbi bitirmişdir.

Əsədov Dağbəyi Nəriman oğlu qiyabi oxuya-oxuya 1977- ci ildə Zəngilaan rayon Kənd Təsərrüfatı idarəsinə baş mühasib təyin olunub.  1982-ci ildə onu Tədarük idarəsinə müdir, 1986-cı

ildə isə ASB-nə baş iqtisadçı təyin etmişlər.

1988-ci ildə Əsədov Dağbəyini rayonun ən böyük təsərrüfatlarından olan «Bakı Fəhləsi» kolxoz idarə heyətinin sədri seçmişlər.

Sonra ona daha böyük etimad göstərilmiş o 1990-cı ildə rayon Statistika idarəsinin rəisi təyin olunmuşdur. Əsədov Dağbəyi Nəriman oğlu 2013-cü ilə kimi bu vəzifədə işlədi.

Dağbəyi Nəriman oğlu 1976-cı ildə Mehrəliyeva Solmaz Hüseyn qızı ilə ailə qurmuşdur. Onların üç övladı, 7 nəvəsi var.

O bir neçə çağırış Zəngilan rayon XDS-nin və Zəngilan şəhər XDS- nin deputatı seçilmişdir.

Əsədov Dağbəyi Nəriman oğlu 23 sentyabr 2020-ci ildə dünyasın dəyişmişdir.

**Əsədov Məhəmməd Nəbi oğlu**

*Polis general mayoru, Zəngilanın ilk generalı.Müstəqil Azərbaycan Respublikasının ilk Daxili İşlər naziri (23.05.1990–18.11.1991). Dövlət müşaviri (18.11.1991-20.11.1991).*



Məhəmməd Əsədov haqqında hər dəfə yazmaq istəyəndə o qorxulu günü heç zaman unuda bilmirəm. Həmin o günlərdə mən Abşeron (Mərdəkan) sanatoriyasında dincəlirdim. Həmin günün axşamı, yəni 20 noyabrda axşam saat səkkizə qalmış televiziyanın qarşısında oturub xəbərlər proqramını gözləyirdik. Saat 8 oldu xəbər verilmədi, yarım saat keçdi yenə də televiziya susurdu. Müəyyən vaxtdan sonra bildirdilər ki, bəs faciə baş verib. Azərbaycanın say-seçmə oğulları qəzaya düşüb. Azərtacın məlumatında bildirilirdi ki, təyyarə dumana düşüb və dağa dəyərək partlayıb.

Görəsən bizim qədər özünə qənim olan bir millət varmı?. Bu

xəbərdən sonra necə demək olar ki, ay erməni təyyarəni sən vurmusan. O da bizim öz məlumatımızı öz gözümüzə soxar və deyər ki, bax bu sənin rəsmi məlumatın, oxu məndən əl çək.

Əsədov haqqında mən ilk dəfə 2001-ci ildə bir yazı yazdım. Hər dəfə də onun haqqında yazmaq istəyəndə məndə qəribə hisslər baş qaldırırdı. Hər zaman məni bir şey düşündürür. Niyə görəsən insan bir qiymətli şey əldə edəndə onu tez itirir. Mən vətənimi, xalqımı, torpağımı, doğulduğum kəndimi çox sevərəm. Bunu hamı deyə bilər. Amma bir şey var ki, gərək onu əməlinlə sübüt edəsən. Mənə ən dar mənada doğulduğum o, ev, sonra o kənd, daha sonra rayonum əzizdir. Bir az da kənara çıxdıqda ölkəm, vətənim Azərbaycan hamısından mənə əzizdir. Bu sevgini bir qədər də geniş mənada ifadə etsək yer kürəsini də sevərəm. Bunların hər birinə məndə özünəməxsus sevgi vardır. Bunları sözlə istədiyim kimi ifadə edə bilmərəm.

Məhəmməd Əsədov da mənim bu sevdiklərimdən idi. Həmişə arzu edərdim ki, bizim də bir müstəqil vətənimiz olsun, dünyanın müxtəlif təşkilatlarından səsimiz gəlsin. Allaha şükür ki, indi bunlara biz malikik. Orta məktəbdə oxuyanda Azərbaycanın Sovet İttifaqı Qəhrəmanları və generalları arasında Zəngilanlı görməyəndə çox məyus olardım. Əsədova general- mayor rütbəsini verəndə, inanın bəlkə də mənim qədər sevinən olmadı. Sanki o adı mənə vermişdilər. Inanın ki, dediklərimin hamısı səmimidir.

Çox təəssüflər olsun ki, mənim bu sevincim uzun sürmədi. Əldə etdiyim ən qiymətli bir varımımı deyim, qazancımımı deyim, bilmirəm itirdim. Allah zalıma lənət eləsin.

Onun haqqında təkrar yazmaq istəyəndə bir az tərəddüd elədim. Düşündüm ki, bəzi gözü götürməzlər deyəcəklər ki, bu yazı da elə əvvəlkinin təkrarıdır. Düşündüm və qərar verdim. Əsədov haqqında nə qədər yazsaq da yenə azdır. Axı o birincidir. İlk yol açandır. Birincilik hər kişiyə nəsib olmur. O Zəngilanın ilk generalıdır. Bundan sonra və qədər generalımız olsa da Əsədovun yeri başqadır. O heç vaxt unudulmaz. Unudulmaz bir də ona görə ki,

o xalqı, vətəni, yolunda canından keçdi.

Məni bir sual da həmişə düşündürür və bu suala məni qane edəcək bir cavab tapa bilmirəm. Qəzaya düşən bu insanların demək olar ki, əksəriyyəti Azərbaycanın say-seçmə, özüdə yüksək vəzifəli adamları idilər. Insan ağlı onların hamısının bir yerə yığışıb belə bir zamanda belə bir bir səfərə getməsini qəbul etmir. Onların hər biri ayrı-ayrılıqda, öz mühavizəsi, vertolyotu (bəziləri) ilə gedə bilərdi. Niyə onların hamısı bir yerə yığışdılar? Niyə onlar ayrı-ayrı, öz şəxsi mühafizələri, maşınları ilə getmədilər? Onlara hər adam əmr verib deyə bilməzdi ki, bu maşına minin, filan yerə gedin. Onların əksəriyyəti əmr verən insanlar idilər.

Mənə elə gəlir ki, onları məcburi surətdə bir yerə toplayıb səfərə göndəriblər. Bu çox düşünülmüş və dəqiq hazırlanmış bir plan idi. Onlara bu əmri kim verə bilərdi ? Belə bir əmr vermək səlahiyyəti ancaq dövlət başçılarının ixtiyarında idi. Biz hələ o zaman tam müstəqil deyildik, Moskvanın tabeçiliyində idik. Belə bir əmrin Moskvadan, özüdə ən yüksək səviyyədən verildiyi görünür.

Hazırkı zamanda bu cinayəti törədənlərin adları rəsmi surətdə elan olumasa da, mən əminəm ki, gələcəkdə bu cinayəti edənlərin adları tam açıqlanacaq. Onlar o vaxt həyatda olmasalar və cəza almasalar belə, Allah Təala onların cəzasını o dünyada verəcəkdir.

Onunla mən cəmisi bir dəfə görüşmüşəm. Bu 1985-ci ildə Füzüli şəhərində keçirilən KXD (Könüllü Xalq Drujinaları)-nın zonalararası müşavirəsində idi.

Bildiyiniz kimi sovet hökuməti SSRİ Dövlət sərhəddinin qorunmasına xüsüsi fikir verirdi. Bu məqsədlə də sərhəd rayonlarında xüsusən də İran ilə sərhəddə yerləşən rayonlarda Rayon XDS İK-ri nəzdində xüsusi bir ştat da açmışdı. Həmin ştatlı işçi DTK-nın rayon şöbəsinin və SSRİ Dövlət sərhəddinin əməkdaşları ilə birlikdə sərhəddin və ictimai asayişin qorunmasında birlikdə hərəkət edirdilər. Ildə bir dəfə bu rayonlardan birində zona

müşavirəsi keçirilirdi. Rayonlarda həmin ştatda olan işçinin işinə işə RİK-nin sərd müavinləri nəzarət edir və adətən belə müşavirələrə onlar gedərdilər. Həmin il RİK-nin sədr müavini Əli Quliyev tədbirdə iştirak etmədiyindən, onun əvəzinə mən (ştatlı işçi) müşavirəyə getməli oldum. Müşavirədə rayon PK I katibləri, XDS İK-nin sədrləri, milis idarəsinin rəisi və DTK-nın rayon şöbəsinin rəisləri iştirak edirdilər. Həmin dövrdə Əsədov Jdanov (indiki Beyləqan) rayon PK-nın I katibi idi.

Mən orada onunla şəxsən tanış oldum və onun necə bir sadə insan olduğunu gördüm.

* * *

Məhəmməd Nəbi oğlu Əsədov 1941-ci il dekabr ayının 5-də Zəngilan rayonunun Baharlı kəndində anadan olub. 1958-ci ildə orta məktəbi Zəngilan rayonunun Mincivan qəsəbəsində bitirib, həmin ildə Bakı Statistika Texnikumuna daxil olub. 1960-cı ildə həmin texnikumu müvəffəqiyyətlə başa vurub və Zəngilan rayonunda inspektor vəzifəsində çalışıb.

1961-ci ildə ordu sıralarına çağırılıb və 1964-cü ilə qədər orduda xidmət edib. 1964-cü ildə ordu sıralarından tərxis olunduqdan sonra Sumqayıt şəhərinə üz tutub və 1 saylı trestdə işləyib.

1965-ci ildə S.M. Kirov adına Azərbaycan Dövlət Universitetinin "Maliyyə-kredit" fakültəsinə daxil olub. 1965-ci ildə 2 saylı trestdə mühasib işləyib, 1967-68-ci illərdə Plan şöbəsinin müdiri vəzifəsində çalışıb.

1968-ci ildə Məhəmməd Əsədov Sumqayıt Şəhər Partiya Komitəsinin Sənaye şöbəsinə təlimatçı vəzifəsinə irəli çəkilib.

Xalq Təsərrüfatı İnstitutu yarandıqdan və "Maliyyə-kredit" fakültəsi bu instituta verildiyindən Məhəmməd Əsədov 1970-ci ildə D.Bünyadzadə adına Azərbaycan Xalq Təsərrüfatı İnstitunun "Maliyyə-kredit" ixtisası üzrə tam kursunu bitirib.

1973-1975-ci illərdə o, Sumqayıt Şəhər Partiya Komitəsində sənaye şöbəsinin müdiri, 1975-1978-ci illərdə isə Təşkilat şöbəsinin müdiri vəzifəsində çalışıb.

1978-ci ildə Məhəmməd Əsədov Ağsu Rayon İcraiyyə Komitəsinin sədri vəzifəsinə göndərilib. 1980-ci ilə qədər Ağsu rayonunda fəaliyyət göstərib. Yaxşı işi qiymətləndirilib və Məhəmməd Əsədov Moskva Təhlükəsizlik Akademiyasına göndərilib. 1982-ci ildə akademiyanı qırmızı diplomla başa vurub. Azərbaycan Təhlükəsizlik Nazirliyində məsul vəzifədə çalışıb.

1983-1986-cı illərdə Jdanov (indiki Beyləqan) Rayon Partiya Komitəsinin birinci katibi vəzifəsində işləyib. İşlədiyi müddətdə göstərdiyi işgüzarlığına, biliyinə, qabiliyyətinə görə onu Mərkəzi Komitəyə dəvət edirlər və 1986-cı ildən 1988-ci ilə qədər Məhəmməd Əsədov inzibati orqanlar şöbəsinə müdirlik edir.

1988-1989-cu illərdə Ağdaş Rayon Partiya Komitəsinin birinci katibi vəzifəsində işləyir. İşlədiyi müddətdə öz təşkilatçılıq qabiliyyəti ilə təsərrüfatın bütün sahələrini ön cərgəyə çıxarır.

1989-1990-cı illərdə bu fəaliyyətini Quba Rayon Partiya Komitəsinin birinci katibi kimi məsuliyyətlə davam etdirir və onun gördüyü bütün işlər yüksək qiymətləndirilir.

Məhəmməd Əsədov 1990-cı ilin may ayında Azərbaycan Respublikasının Daxili İşlər naziri vəzifəsinə təyin edilir. Nazir işlədiyi müddətdə günlərinin çoxunu Qarabağ bölgəsində keçirir. Əsgərlərlə çiyin-çiyinə səngərlərdə gecələyir.

1990-cı il noyabr ayının 5-də Məhəmməd Nəbi oğlu Əsədova general-mayor rütbəsi verilir. Buna baxmayaraq o yenə günlərini sərhəd zonalarında, əsgərlər arasında keçirir. Azərbaycanın sərhədlərinin bütövlüyü uğrunda mübarizə aparır. Çoxlu qəhrəmanlıqlar göstərir və xalqın gözündə daha da yüksəlir. 1991-ci ilin noyabr ayına qədər Daxili İşlər naziri vəzifəsində çalışır. Məhəmməd Əsədov göstərdiyi şücaətə görə müşavir kimi yüksək vəzifəyə təyin edilir.

Məhəmməd Əsədov 1991-ci il noyabr ayının 20-də dövlət xadimləri ilə birlikdə öz dövlət vəzifələrini və vətəndaşlıq borclarını yerinə yetirmək üçün vertolyotla Ağdam şəhərinə uçur və Qarakənd səmasında dəhşətli, yaddaşlardan silinməyən və xalqı-

mızı həmişə ağrıdan o qanlı vertolyot faciəsi baş verir. Vertolyot ermənilər tərəfindən vurulur və xalqımızın azadlığı, torpaqlarımızın bütövlüyü uğrunda gedən mübarizədə Məhəmməd Nəbi oğlu Əsədov da qəhrəmanlıqla, faciəli şəkildə həlak olur.

Məhəmməd Əsədov haqqında bu gün də olmasa gələcəkdə çox şeylər yazılacaq və o həqiqi qiymətini alacaqdır.

**Əzimov Əfsər İsaq oğlu**

*Müharibə (1941-1945) və əmək veteranı*



Əzimov Əfsər İsaq öğlu Zəngilan rayonunda uzun müddət sovet orqanlarında çalışmış müraribə və əmək veteranı kimi rayonda tanınan insanlardan biridir. O 1923-cü ildə Zəngəzur qəzasının Məmmədbəyli kəndində anadan olmuşdur. Orta məktəbi bitirən bir çox yaşıdları ilə birlikdə onu Bakı şəhərinə, neft sahəsi üzrə oxumağa göndərirlər. 1941-ci ildə müharibə başlayanda onları neft sahəsində çalışdıqlarına görə əvvəlcə müharibəyə aparmırlar. Atasının müharibəyə getdiyini eşidəndə o Bakıdakı işini buraxıb ailəyə kömək etmək məqsədi ilə rayona qayıdır. Bir müddət sonra daha dəqiq desək, 1942-ci ilin yanvarında onu da cəbhəyə göndərirlər. Onun döyüş yolu Mazdok, Qroznı, Kislovodsk, Krasnodar v.s yerlərdən keçir. 14 aprel 1943-ü ildə Krasnodar yaxınlığında iki ayağından ağır yaralanır. Hərbi hospitalda 3 ay müalicə olunur, yaralarının ciddi olduğunu görən həkimlər onu arxa cəbhəyə Bakıya göndərirlər. Müharibə bitəndən sonra o yenidən hərbi xidmətə göndərilir. 1946-1947-ci illərdə Kamçatkada, Petropavlovsk şəhərində hərbi xidmətdə olur. Əfsər dayının sinəsini müharibə və arxa cəbhə Orden və medalları bəzəyir. O I dərəcəli «Vətən Müharibəsi» Ordeni, Almaniya üzərində qələbəyə görə və daha neçə -neçə medalarla təltif olunub.

Müharibədən sonra döğma kəndinə qayıdan Əfsər Əzimiov 10 aprel 1947-ci ildən 30 may 1997-ci ilə kimi, düz əlli il Məmmədbəyli kənd KXS İK-də əvvəllər sədr sonra isə katib işləmişdir. Arxa cəbhədəki fəaliyyətinə görə isə ona «Qırmızı Bayraq» ordeni verilir. Biz Əfsər dayının medallarını sadalamaqla sizləri yormaq istəmirik. Əzimov Əfsər 2018-ci ildə dünyasını dəyişib.

**Heydərov Məhəmməd Heydər oğlu**
*Zəngilan RİK -nin sədrlərindən*
*Ordenli Müharibə (1941-1945) və əmək veteranı*



Sovet tarixşünaslığında Böyük Vətən Müharibəsi adlandırılan 1941-1945-ci illərdə olmuş dəhşətli müharibə 100 milyona yaxın insan həyatına son qoydu, O vaxt SSRİ- nin tərkibində Azərbaycan da istəyindən asılı olmayaraq bu müharibədə iştirak etmişdir. Bu dövrdə dünyada istehsal olunan neftin 74 fazini verən Azərbaycan demək olar ki, hər sahədə müstəsna rol oynayırdı. Müharibədə 647000 nəfər soydaşımız istirak etmişdi ki, onlardan da 275 000 ya həlak olmuş, yada ki, itkin düşmüşdür. Həmin döyüşlərdə axıra kimi vuruşan, qələbəni Berlin şəhərində qeyd edənlərdən biri də əks kəşfiyyat kapitanı, həmyerlimiz Heydərov Məhəmməd Heydər oğludur.

XX əsrin əvvəllərində 1908-ci ildə Zəngəzur qəzasının Malatkeşin kəndində anadan olmuş, Məhəmməd Heydər oğlu erkən yaşlarında atasını itirmiş, anasının himayəsində qalmışdır. 1927-ci ildə kənd məktəbini bitirdikdən sonra kənddə təsərrüfatla məşğul olmuşdur. Bu dövr Azərbaycanın ucqar rayonlarında qolçomaqlarla mübarizə dövrü kimi yadda qalmışdır.

1930-cu ildə ətraf kəndlərdən və qonşu rayonlardan olan Sovet hökümətinin siyastətindən və kolxoz qurulşundan nara-

zı varlılar qaçaqçılıq yoluna düşərək Sobu kəndinin ətrafındakı meşələrdə gizlənmişdilər. Onların özbaşınalığından yerli camaat da əziyyət çəkirdi. Qaçaqlarla mübarizədə Məhəmməd Heydərov da yerli milis dəstələrinə yaxından kömək etmişdir. Həmin dövrdə rayon milis idarəsinin rəsi olan Bayromov Həsənqulu Camal oğlunun Məhəmməd Heydərova verdiyi zəmanətdən.

«1928- 1930 cu illərdə mən rayonda Milis rəisi vəzifəsində işləyirdim. O zaman yerli kulaklar, qolçomaqlar banditlik edərək sərhədi İran tərəfdən keçirdilər, və özləri kimilərini də başlarına toplayıb Zəngilan rayonunun ərazisini keçib kəndləri talan edirdilər. İrandan keçmiş böyük bir banda Sobu meşəsində toplaşıb kəndi ələ keçirmişdilər. Digər bir dəstə isə Leşkər adlı yerdə məskən salaraq oradakı əhaliyə əziyyət edirdilər. Onlara qarşı mübarizədə Heydərov Məhəmməd Heydər oğlu bizimlə birlikdə iştirak etmişdi».

Bundan bir qədər sonra onu orduya çağırdılar. 1930-1932-ci illərdə Bakıdakı Azərbaycan diviziyasının tərkibində xidmət elədi. 1932-ci ildə partiya məktəbinə daxil olan Heydərov məktəbi bitirəndən sonar Ağdam rayon Komsomol Komitəsinə işə göndərilir.

1934-cü ildə Zəngilana qayıdan Heydərov rayon Komsomol Komitəsinə I Katib seçilir. 1935-ci ilin sonunda onu Azərbaycan KP MK- nın nəzdindəki məktəbə göndərirlər. Məktəbi bitirdikdən sonra yenidən rayona dönən Heydərov Torpaq Şöbəsinə müdir təyin olunur. 1938-42 ci illərdə rayonda çıxan «Stalinçi» qəzetinin redaktoru olmuş, 1942-ci ildə müharibənin başlaması ilə əlaqədar orduya səfərbər olunan Heydərov bu işdən azad olunur. Onun Qafqazdan başlanan döyüş yolu Berlində sona çatir.

Ordudan təxris olduqdan sonra rayona gələn Məhəmməd Heydərov rayon Partiya komitəsinin III katibi, rayon XDS İcraiyyə Komitəsinin sədri kimi mühüm vəzifələrdə çalışmışdır. 1954-cü ildə onu Bakı Ali partiya məktəbinə göndərirlər. 1958 ci ildə Ali Partiya məktəbini bitirəndən sonra rayon Kənd Təsərrüfatı

Müfəttişliyinə Rəis təyin olunmuşdur. Sonrakı illərdə müxtəlif vəzifələrdə çalışan Məhəmməd Heydər oğlu Heydərov 1992-ci ildə dünyasını dəyişmişdir. Allah rəhmət eləsin.

## Odlu illərdən qalan izlər

Əsrimizin 8-ci ilində dünyaya göz açmış Məhəmməd Heydərovunda həmyaşıdları kimi həyatı çox çeşməkeşli dövrə-Birinci Dünya müharibəsi, inqilab çarpışmaları, vətəndaş müharibəsi , erməni (hay-Ə.S) -azərbaycan qırğını, 1937-38-ci illərin repressiyası dövrünə təsadüf etmişdir.Bu illər ərzində o təhsil almaq, özünə həyat qurmaq üçün nə qədər əziyyətlərə qatlaşmalı olmuşdur. Ancaq dözümü ilə sınaqlardan, çətinliklərdən bacarıqla çıxmış, müxtəlif idarəetmə orqanlarında, komsomol işində, rayon qəzetində səmərəli fəaliyyət göstərib özünə mövqe və nüfuz qazana bilmişdi. Yenicə ailə qurmuşdu ki, müharibə başladı.

Onda M.Heydərovun 43 yaşı varidi. 1942-ci ildə orduya səfərbərliyə alındı. Azərbaycanlılardan ibarət 416-cı Taqanroq diviziyasının 1366-cı alayının tərkibində Berlinə qədər döyüş yolu keçməli oldu. Sıravi əsgərdən kapitan rütbəsinədək yüksələn M.Heydərov alayın xüsusi şöbəsində çalışırdı. Əsgərlər arasında intizamı möhkəmlətmək, onların döyüş ruhunu yüksəltmək, kəşfiyyat işlərini səmərəli aparmaq, təxribat, satqınlıq hallarına qarşı mübarizə tədbirlərinin təşkilində xüsusi şöbə xüsusi rol oynayırdı. Diviziyanın Taqanroq şəhərinin alınması uğrunda göstərdiyi şücaət 1941-1945-ci ilıər müharibəsinin salnaməsinə ən parlaq bir hünər kimin yazılmışdır. Bu şəhər uğrunda gedən mubarizədə kapitan M.Heydərov da fərqlənmişdi.

O, Qırmızı Ulduz, döyüş şücahətinə görə, 1 və 2 dərəcəli Vətən müharibəsi Ordenləri, igidliyə görə, habelə 11 digər fərqləndirici medalla təltif olunmuş, dəfələrlə Baş Komandanlığın təşəkkürünə layiq görülmüşdür. Bütün bunlar odlu-alovlu illərin yadigarlarıdır. M.Heydərov 1946-cı ildə tərxis olunaraq doğma Zəngilan ra-

yonuna qayıdan kimi bərpa və quruculuq işlərində fəal iştirak etmişdir. O təsərrüfat orqanlarında, habelə rayon XDS İcraiyyə Komitəsinin sədri kimi məsul vəzifılərdə çalışmışdır. İşlədiyi bütün vəzifələrdə, cəbhədə olduğu kimi  yüksək əsgəri intizam göstərmişdir. Sayılıb seçilən, prinsipial bir adam idi. İstər müharibəyə qədər çalışdığı mülki işlərdə, istər müharibə dövründə və istərsə də bərpa və quruculuq illərində keçdiyi həyat yolu gənc nəsillərə göstərməyə layiq olan ibratəmiz  nümunədir. 1990-cı ilin fevral ayı idi. Erməni təcavüzü getdikcə şiddətlənirdi. Bakıda baş verən 20 yanvar faciəsi hamını sarsıtmışdı.

Ermənistanın Qafan və Mehri rayonları ilə 157 km sərhıdi olan Zəngilan hər gün ağır silahlardan şiddətli atəşlərə məruz qalırdı. 82 yaşlı veteran fiziki cəhətdən nə qədər sağlam görünsə də, erməni təcavüzünə qarşı daxili qəzəb onu möhkəm sıxırdı. Hər gün baş vetən faciələr qarşısında veteranın ürəyi tab gətirmədi. Onu  ermənilər  tərəfindən atılan atəşlər altında dəfn etmək lazım gəldi.Hər il rayon əməkçiləri 9 mayı müharibə əleyhinə, sülh uğrunda mübarizə əlaməti altında qeyd edi.

Cəbhədən qayıtmayan, sonradan dünyasını dəyişən veteranların xatırəsi ehtiramla yad olunub. Artıq üçüncü ildir ki, bu tədbiri keçirməkdən məhrum olmuşuq. Hətta veteranların çoxları bir-birlərinin  harada məskunlaşdıqlarını bilmirlər. Acınacaqlı haldır. Ancaq dözməkiyik-o ağır günlərin  şahidi olmuş kişilər kimi.

**M.Qocayev,** Zəngilan rayon müharibə və əmək veteranları şurasının üzvü. «Sərhəd» qəzeti, 9 may 1996-cı il  . N-16

## Həsənov Əbil Məmi oğlu

*Ordenli Müharibə (1941-1945)və əmək veteranı*
*Hərbi təyyarəçi*



Əbil müəllim sözün həqiqi mənasında müəllim idi. Zəngilan şəhərində 60-cı illərdə bir orta məktəb var idi. 1965-ci ildə həmin məktəbin dördüncü sinifini bitirdik. Sentyabrın birində dərsə gələndə bizim A sinfini içəri buraxmadılar. Bütün siniflər içəri keçdi, biz isə məktəbin qarşısında gözləməli olduq. Bir qədər gözlədikdən sonra bizim sinfi başqa məktəbə apardılar. Beləliklə 1965-66-cı tədris ilində Zəngilan şəhərində 8-illik məktəb açıldı. Məktəbin direktoru Əbil Məmi oğlu Həsənov idi. O vaxt Əbil müəllim həm direktor idi, həm də rus dili dərsi verirdi. 1969-cu ildə 8-ci sinifi bitirdim. Hələ imtahanlar qurtarmayıbdı. Valideynlərimin razılığı və mənim istəyimlə sənədlərimi Naxçıvan şəhərindəki Pedaqoji Texnikuma vermək istəyirdim. Səbəbi də o idi ki, bizim qonşunun qızı (Cəfərova Solmaz Səfiyar qızı) da orada oxuduğundan mənim də ora gedib gəlməyim çətin olmazdı. 8-ci sinfi bitirənlərə adətən şəhadətnaməni vermirdilər. Səbəbi də o idi ki, onlar yeni dərs ilində Zəngilan şəhər orta məktəbinin IX- cu sinfinə gedəcəkdilər. Artıq imtahanlar qurtarmışdı. Bir gün atam dedi ki, mən Əbil müəllimdən xahiş elədim ki, sənin 8-illik şəhadətnaməni yazıb versin. Gedib onu alarsan. Evdən mənə pul verdilər ki, bunu Əbil müəllimə ver və şəhadətnaməni al. Pulu aldım və sayanda gördüm ki, 17 ədəd 3 manatlıqdır. Mən Əbil müəllimin evini tanımırdım. Onun bacısı bizim məhəllədə yaşayırdı. Mən onlara getdim və dedim ki, Əbil müəllimi görmək istəyirəm. O, dedi ki, Əbil müəllim sənin nəyinə lazimdir? Mən cavabında dedim ki, atam söz tapşırıb onu deyəcəyəm. Mən onun oğlu Rafiq ilə Əbil müəllimin evinə getdim. O aralıdan evi mənə göstərib geri döndü.

Mən həyət qapısını döydüm və bir az gözlədikdən sonra gödüm ki, Əbil müəllim evdən çıxdı və qapıya tərəf gəlir. O, məni görəndə soruşdu ki, Əli nə olub, nə istəyirsən?

Mən həm qorxa-qorxa, həm də utanaraq əlimdəki pulu ona tərəf uzatdım və dedim: Bunu Sefi göndərdi sizə (atamın əsl adı Seyfulla olsada hamı onu Sefi olaraq tanıyırdı, elə biz də ona bu adla müraciət edərdik). O əlimdəkinin pul olduğunu görəndə dedi ki, apar onu ver atana. Mən özümü itirmişdim və pərt olmuşdum. Əbil müəllim pulu götürmür, mən isə onu ona vermək istəyirdim. O get deyir, mən isə yerimdən tərpənmirdim. Pulu onun üstünə atıb, qaçmaq istəyirdim. Sanki yuxuda idim, birdən ayıldim və anladım ki, o məktəbin direktorudur, mən isə şagird. Suyu süzülə süzülə geri gəldim. Evdə atam, anam da narahat oldular ki, birdən Əbil müəllim sənədi verməz işimiz pozular. Aradan üç-dörd gun keçəndən sonra məni məktəbə dəvət elədi. Qorxurdum ki, o günkü məsələni ortaya atıb məni danlayacaq və məni utandıracaq. Yanılmışdım. O, heç nə olmayıbmış kimi əlinə yazılmamış bir şəhadətnamə alib, adımı, atamın adını dəqiq deməyimi söylədi. Mən də necə var elədə dedim, o, isə yazmağa başladı. Sonra imtahanlarda aldığım qiymətləri şəhadətnaməyə yazdı. Sənəd hazır olanda qol çəkib mənə verdi və tapşırdı ki, apar müəllimlər də qol çəksinlər. Müəllimlərə qol çəkdirib geri gətirdim, alıb möhür vurub mənə verdi.

Mənim atam zəhmətkeş bir adam idi. Dürüstlüyünə və səmimiyyətinə görə nəinki sadə peşə adamları eyni zamanda rayonun bir çox irəli gələn şəxsləri də ona hörmət bəsləyirdilər.

Həsənov Əbil Məmi oğlu 9 may 1920-ci ildə Zəngəzur qəzasının Malatkeşin kəndində anadan olmuşdur. Kənd məktəbini bitirdikdən sonra ordu sıralarına çağırılıb.

1939-cu ilin noyabr ayından 1940-cı ilin iyun ayına kimi Kiyev xüsusi hərbi dairəsində Kotovski adına 34-cü süvari polkunda xidmətə başlayır. 1940-cı ilin iyun-oktyabr aylarında həmin hərbi dairədə Belaya Rezkov şəhərində kiçik aviasiya məktəbin-

də kursant olur. 1940-cı ilin noyabrından 1941-ci ilin may ayına kimi Kiyev xüsusi hərbi dairəsində 224-cü sürətli bombardımançı diviziya polkunun 17-ci aviasiya diviziyasında motorçu, 1941-ci ilin mayından 1942-ci ilin dekabrına kimi Cənub Qərb Cəbhəsi 224-cü sürətli bombardımançı aviasiya polkunda, aviasiya şturmanı olmuşdur. 1942-ci ilin dekabrından 1945-ci ilin aprel ayında kimi II Ukrayna Cəbhəsində 859-cu ayrıca aviasiya bölməsində xidmət keçmişdir. Əbil Həsənov müharinbə zamanı düşmən mövqelərinə yüzlərcə uçuş etmiş, onların xeyli hərbi qüvvəsini və texnikasını sıradan çıxarmışdır..

1946-cı ilin iyununda ordudan təxris olunduqdan sonra Əbil Həsənov oktyabr ayından Zəngilan PK da texniki katib kimi əmək fəaliyyətini davam etdirir. Sonralar o, təlimatçi və şöbə müdiri vəzifələrində çalışmıışdır. 1952-ci ilin oktyabrında onu iki illik Ali Partiya Məktəbinə göndərdilər. 1954-cü ildə məktəbi bitirdikdən sonra rayona qayıdır və Payon PK-də işə başlayır. Əbil Həsənov bir müddət sonra Rayon PK-nin II katibi vəzifəsinə seçilir. 1958-ci ildə o qiyabi olaraq Azərbaycan Pedoqoji İnstitutunun tarix fakültəsini bitirir. Sonrakı illərdə Əbil Həsənov rayon Maarif Şöbəsində müdür, İstehlak Cəmiyyətində (RİC) sədr, Əhaliyyə Məişət Xidməti Kombinatında direktor vəzifəsində çalışmışdır. 1965-ci ilin avqustundan 1990-cı ilə kimi, düz 25 il Əbil Həsənov Zəngilan şəhər 8 illik məktəbin direktoru olmuşdur. Onun son iş yeri isə Zəngilan rayon Bilik Cəmiyyəti idi. Əbil Həsənov müharibədəki xidmətlərinə görə «Böyük Vətən Müharibəsi» ordeni, 1941-45-ci illərdə rəşadətli əməyə, Almaniya üzərində qələbəyə görə və daha 6 medal ilə təltif olunmuşdur. O böyüməkdə olan gənc nəslin təlim-tərbiyəsi sahəsində mühüm işlər aparırdı. Eyni zamanda müharibə və əmək veteranları rayon şurasının sədri kimi veteranların problemlərinin həlli istiqamətində də əlindən gələn köməyi əsirgəmirdi.

Əbil Məmi oğlu Həsənov 1993-cü ildə dünyasını dəyişmiş və Zəngilan şəhər qəbiristanlığında dəfn olunmuşdur. Sadə və

qayğıkeş insan olan Əbil Həsənovun xatirəsi həmişə yad ediləcəkdir.

## Həsənov Həsən Şükür oğlu



Həsənov Həsən Şükür oğlu 1933-cü ildə Zəngilan rayonunun Ördəkli kəndində anadan olub. İlk təhsilini kənd məktəbində alıb. 1953-56-cı illərdə hərbi xidmətdə olan Həsən Şükür oğlu hərbi xidmət illərində sürücülük kursunu bitirib. Hərbi xidmətdə özünü nümunəvi göstərdiyinə görə ona hissə komandirinin yazılı əmri ilə təşəkkür elan edilib. Hərbi xidməti və eyni zamanda da kursu bitirdikdən sonra rayondakı tikinti təmir idarəsində sürücü kimi əmək fəaliyyətinə başlayıb. Onu işə tikitni-təmir idarəsinin o vaxtkı müdiri Bəhmən Allahverdiyev qəbul edib. Burada o 1957-59 -cu illərdə sürücü işləyib.

Zəngilan rayon ZDS İcraiyyə Komitəsinin sədri Şəfaət Mehtiyev onu rayon ZDS İcraiyyə Komitəsinə sürücülüyə qəbul edib. 1963-cü ildə ZDS İK-nə yeni sədr seçilən Nəzir Kərimov da onunla işləməyə qərar verib. Onu özünə şəxsi sürücü götürmüşdür. Nəzir Kərimov onunla burada 1968- ci ilə kimi işlədi. (N.Kərinov 1963-1968-ci illərdə rayon ZDS İK- nin sədri, 1968-1979-cu illərdə isə Zəngilan rayon Partiya Komitəsinin I katibi olub.) Özünü yaxşı və işini bilən biri kimi göstərən Həsənov Həsən Şükür oğlu sonrakı illərdə də Kərimovla işlədi. 1968-ci ildə Nəzir Kərimov rayon partiya Komitəsinin I katibi seçiləndə Həsən dayını da özü ilə yeni iş yerinə apardı. 05 yanvar 1980-ci ildə I katib seçilən Muradxan Cabbarov isə Həsən dayı ilə 1988-ci ilə kimi işlədi. Həsən dayı üst-üstə 25 il rəhbər şəxslərin sürücüsü olub. Bu rayon tarixində bir rekorddu. 1988- ci ildə rayona gələn yeni I katib oğul Mehtiyev (əvvəllər Zəngilan RİK-nin sədri işləmiş

Şəfaət Mehtiyevin oğlu) onu işdən alıb, RİK-nin qarajına müdir təyin etdi.

Həsənov Həsən Şükür oğlu bu vəzifədə 07 aprel 1991-ci ilə kimi, yəni dünyasın dəyişənə kimi işlədi. Həyat yoldaşı Quliyeva Gülbahar İsmayıl qızıdı. Övladları

-oğlu Şükür Həsən oğlu-ali təhsilli mühəndis, qızı Həsənova Aygün Həsən qızı-ali təhsilli, qızı Sevil Həsən qızı -orta ixtisas təhsilli, qızı Sevda Həsən qızı- ali təhsilli, oğlu Şakir Həsən oğlu-orta təhsili

Həsən dayını 1960-cı ildə «ata Mehtiyev işə **qəbul edib, 1988-ci ildə isə oğul Mehtiyev işdən azad edib..**

Mən Həsən dayını 1964-1965-ci illərdə görmüşdüm. O illərdə daha doğrusu Kərimov Nəzir rayonda qardaşı Heydərqulu müəllimin evində yaşayırdı. Mən suvarma kanalının yanı ilə qəsəbənin mərkəzinə o yolla gedərdim. O vaxt Həsən dayı köhnə Bir «Villis» ilə gəlib Heydərqulu müəllimin evinin yanında dayanardı. Nəzir Kərimovu hər gün günorta yeməyinə gətirərdi. Sonrakı illərdə daha doğrusu 1968-ci ildə N.Kərimov I katib seçiləndən sonra buradan köçdü.

Mənim üçün Zəngilanın canlı arxivi olan Asif Bağırovdan Həsən dayını soruşdum. Onun dedikləri:

-Həsən mənim tanıdığım rəhbər işçilərin sürücülərdən ən təmizi, safı, öz işini bilən biri idi. O heç kimdən rəhbərə şikayət etməz, əksinə onları qoruyardı. O, Nəzir Kərimovla sahələrləri gəzən zaman birinin ot biçdiyini və ya sahədən bir şey aldığını aralıdan görəndə maşını daldada saxlar və ya Kərimova nəsə deyib onun fikrini yayındırardı ki, adamı görməsin.

O eyni zamana yaxşı ailə başçısı idi. Övladlarını yaxşı tərbiyə eləmişdi. Deyərdim ki, Həsən, «qara» Məmməd kimilərin dən yaxşı müəllim olardı. Onların hər ikisinin natiqlik qabilyyəti var idi. Danışarkən fikirlərini sərbəst ifadə etmələri onların yaxşı müəllim olmaları xüsusiyyətini göstərir. Həsən dayının oğlu Şükürün dedikləri:



СВЕДЕНИЯ О РАБОТЕ

| № записи | Дата: Год | Месяц | Число | Сведения о приеме на работу, перемещениях по работе и увольнении (с указанием причин) | На основании чего внесена запись (документ, его дата и номер) |
|---|---|---|---|---|---|
| 1 | 2 | | | 3 | 4 |
| 4. | 1968 | 0X | 01. | Башга иша кечмаси илә әлагәдар олараг Рајон Ичраијјә Комитәсинин миниk автомашынын сүрүчүлүјүндән азад едилсин. Зәнкилан рајон ИДС Ичраијјә Комитәсинин сәдри: Н. Кәримов. | РИК-нин 1/X-1968-ил 80 №: ли әмри. |
| 5 | 1968 | 0X | 1. | Рајон Партија комитәсинин автомобил сүрүчүсү тәјин олунсун. Азәрб. КП. Зәнкилан РК-нин катиби: Н. Кәримов | РПК-нин 1/X.1968-ci тарихли 16 №-ли сәрәнчамы. |

Qaçqınlıqdan sonra Muradxan Cabbarov gəlib bizi Bakıda tapdı, vəziyyətimizlə maraqlandı. O mənə belə dedi: -Bilirsən atanı niyə çox istəyirdim. Dedim ki, yox, haradan bilim. O, belə dedi:

**-Həsən məni zəngilanlılardan, zəngilanlıları da məndən qorudu.**

Gözəl məntiqdi, elə deyilmi?

Bu sənəddə maraqlı bir məlumat var. Nəzir Kərimov 1968-ci ilin 1 oktyarbırında günortaya kimi Rayon İK-nin sədri, günortadan sonra isə Rayon PK-nin I katibi olub. Bir gündə iki vəzifəni daşıyıb.

## Həsənov Hidayət Mirzəmməd oğlu



Hidayət Mirzəmməd oğlu Həsənov 26 sentyabr 1954-ci ildə Zəngilan rayonunun Məlikli kəndində anadan olmuşdur.

1961-1971-ci illərdə kənd Zəngilan orta məktəbində oxumuşdur. Orta məktəbi bitirəndən sonra Lenin adına sovxozda fəhlə kimi əmək fəaliyyətinə başlamış, 1972-1973-cü illərdə Bakı yerli Sənaye Texnologiya Texnikumunda oxumuşdur.

1976-cı ildən Hidayət Həsənov sovet orqanlarında işə başlamış, Zəngilan rayon XDS İK-də Mülki Müdafiə Qərargahının rəisi (1976-1983), ümumi şöbənin müdiri (1983-1989) olmuşdur. 1987-ci ildə Hidayət Həsənov V.İ.Lenin adına APİ-nin coğrafiya fakültəsini bitirmiş, sonrakı illərdə 144 saylı Peşə məktəbində direktorun müavini, Lenin adına sovxozun ilk partiya komitəsinin katibi (ştatlı) olmuşdur. Rayon sovetinin deputatı olan Hidayət Həsənov 02 fevral 1993-cü ildə Zəngilan rayon XDS sədrinin müavini seçilmişdir. Rayonun işğalından sonra müəyyən dövrdə işsiz qalan Hidayət Həsənov 1998-2006-cı illərdə rayon İcra Hakimiyyətində əvvəl məsləhətçi, sonra isə referant olmuşdur.

2006-cı ilin martın 1-dən Zəngilan rayon İH başçısının Zəngilan kənd inzibati ərazi dairəsi üzrə nümayəndəsi təyin olunub.

Azərbaycan Respublikası Prezidentinin 27 iyul 2013-cü il tarixli sərəncamı ilə Həsənov Hidayət Mirzəmməd oğlu «Uzun il**lər dövlət qulluğunda səmərəli fəaliyyətinə görə»** medalı ilə təltif olunub.

Hidayət Mirzəmməd oğlu Həsənov hazırda təqaüddədir.

## Hüseynov Bəndalı Mehralı oğlu



Hüseynov Bəndalı Mehralı oğlu 01 iyun 1932-ci ildə rayonun İskəndərbəyli kəndində anadan olub. İlk təhsilini kənd məktəbində alan Bəndalı atasını erkən itirmişdir. Atası Mehralı Kəlbəlayi Hüseynalı oğlu müharibədən əvvəl vəfat etmişdir. Məhz bu səbəbdən gənc Bəndalı 7-ci sinifdən məktəbdən uşaqlaşmış və ailəyə kömək məqsədi ilə əmək fəaliyyətinə başlamışdır.

Bəndalı Mehralı oğlunun özündın böyük qardaşı Əsgər 1941-1945-ci illər müharibəsində döyüşən orduda vuruşmuş və Ukraynanın Xarkov vilayəti uğrunda gedən döyüşdə həlak olmuşdur. Baquslavka kəndindəki qardaşlıq qəbiristanlığında onun da xatirəsi əbədiləşdirilib. Hüseynov Bəndalı Mehralı oğlu 1950-1955-ci ildə elə qardaşının həlak olduğu Ukraynada 5 il hərbi xidmətdə olub.

Anası Hüseynova Reyhan Əhməd qızıdır.

Bəndalı Hüseynovun hərbi biletində isə 1962-ci ildə 9-cu sinifi bitirdiyi qeyd olunur. Asif Bağırov deyir ki, o sonralar rayon qiyabi axşam orta məktəbini bitirib. Hüseynov Bəndalı Mehralı oğlunun əmək kitabçasından bəzi qeydlər

1. Hüseynov Bəndalı 05 may 1956-cı ildən Rayon sənaye kombinatında dəllək təyin edilsin. **Kombinatın direktoru Zamanov. Əmr N-81.05 May1956.**

2. İxtisası və özünün razılıq ərizəsi nəzərə alınmaqla bu gündən etibarən Zəngilan rayon ƏMXK-da mühasib təyin edilsin. **Direktor Əsədov. Əmr N-54.01.07.1982**

Bir müddət sonra o əvvəlki bərbər işinə qayıtmış və rayonun işğalına kimi əhaliyə sözün əsil mənasında xidmət etmişdir.

İşlədiyi müddətdə o həm kənd, həm də ki şəhər sovetinin deputatı seçilmişdir.

Əməyinə yüksək qiymət verilmiş o 2005-ci ildə Prezident İlham Əliyevin sərəncamı ilə 1941-1945-ci illərdə arxa cəbhədəki xidmətlərində görə qələbənin 50 illik yubiley medalı ilə də təltif olunub. O eyni zamanda daha üç medalla, dəfələlrə sosializm yarışının qalibi, kommunist əməyi zərbəçisi döş nişanları, «Fəxri Fərmanla» təltif olunub.

Bandalı dayının özündən başqa iki qardaşı və üç bacısı olub. Hüseynov Bəndalı 1957- ci ildə Əsgərova Ulduz Musa qızı ilə evlənib. Onların 3 oğlu, bir qızı var.

Oğlanları Dərgah, Fəxrəddin, Nizami, qızları Yeganə.

Ulduz xanın 11 avqust 1994-cü ildə, Bəndalı Hüseynov isə 25 iyul 2021-ci ildə vəfat etmişlər.

**Bəndalı Hüseynov barədə Asif Bağırovun dedikləri:**

**-**Bəndalı özün-sözün bilən, ağır təbiətli düz adam idi. Xeyrə şərə yarayan, qonşu adamı olub O məhəllə ilə həqiqətən elə qaynayıb qarışmışdı ki. Heç vaxt nahaq danışmazdı. Sənətinin ustası idi. Ona görə bizlər gedib onun, İzzətin və Rafiqin (Atışın) yanında dayanıb növbə gözlərdik. O da heç vaxt Fərhadov Əli kimi nahaq şeyə hə deməzdi.

## Hüseynov Murtuza Şəmil oğlu

*Rayon qəzetinin redaktorlarından*



Hüseynov Murtuza Şəmil oğlu 1922 ci il 03 sentyabrda Zəngilan rayonunun Qıraq Müşlan kəndində anadan olub. Orta təhsilini Kənd Zəngilan məktəbində alıb.

Gənc yaşlarında 2-ci dünya müharibəsinə yollanıb. Belqorod və Kursk uğrunda döyüşlərdə iştirak edib. 2 dəfə ağır yaralandıqdan sonra ordudan tərxis olunub. Müharibədən sonra Bakı Ali partiya məktəbini bitirib. Kənd Zəngilan məktəbində tarix müəllimi işləyib. 1953-1956-cı illərdə «**Zəngilan Kommunisti**» qəzetinin redaktoru, Rayon Mədəniy-

yət şöbəsinin müdiri, İcraiyyə komitəsində şöbə müdiri, Rayon İstehlak Cəmiyyətində Tikinti Materialları və Mebel Anbarının müdiri vəzifələrində çalışıb. Sonra təqaüdə çıxıb. Hüseynov Murtuza Şəmil oğlu II qrup 1941-1945- ci illər Müharibəsi əlili idi. O, 30 sentyabr 1990-cı il tarixində Zəngilan şəhərində vəfat edib. Dörd oğlu, iki qızı var. Murtuza Hüseynov ilə mən bir neçə il bir yerdə işləmişəm. O vaxtlar mən orta məktəbi təzəcə bitirmişdim. Ali məktəbə daxil ola bilmədim və atam məni də özü işlədiyi yerdə RİC-də fəhləliyə düzəltdi. Mən orada üç il işlədim. Ayın 20-25 gününü başqa andarda çalışar, ayda 4-5 gün də Murtuza Hüseynovun müdir olduğu anbarda işlərdik. Onun yanına işləməyə gedəndə fəhlələr sevinər və həvəslə orada işləməyə gedərdilər. Bu adam fəhləyə qiymət verərdi. Əslində bu bizim vəzifəmiz idi və bunun müqabilində bizə əmək haqqı verirdilər. Amma məsələ onda idi ki, bu adam bizi insan gözündə görər və qayğı göstərərdi. Onun yerinə kim olsaydı başqa cür hərəkət edərdi. Satdığı tikinti materialarını imkanı olmayanlara ya borc verər, ya da ki, hissi-hissə ödəməsinə şərait yaradardı. Allah rəhmət eləsin.

**Hüseynova Sona Mirzə qızı**



Hüseynova Sona Mirzə qızı 10 may 1928-ci ildə o vaxtkı Qubadlı rayonunun Yeməzli kəndində anadan olub. İlk təhsilini kənd məktəbində almış sonralar Gilətağ kənd orta məktəbini bitirmişdir. Orta məktəbi bitirdikdən sonra Ağdam rayonundakı müəllimlər İnstitutuna daxil olyub. Orani bitirdikdən sonra bir müddət müəllim işəldikdən sonra onu rayon komsomol komitəsinə I katib seçmişlər.

Hüseynova Sona Mirzə qızı ilk illərdə partiya sistemində işləmişdir. O dekabr 1960-cı və 10 avqust 1961-ci ildə Rayon PK-nin plenumlarında Raykomun III katibi vəzifəsinə seçilib. Sonralar Zəngilan şəhər orta məktəbində gənc nəslin təlim-tərbiyəsi ilə məş-

ğul olmuşdur. Hüseynova Sona Mirzə qızının həyat yoldaşı istedadlı jurnalist Bəxtiyarov Nəriman Şahsuvar oğlu Zəngilanda nəşr olunan «Kənd Həyatı» qəzeti redaksiyasında redaktorun müavini olmuşdur. Onların Elbrus, Vidadi və İldırım adlı üç oğlu olub. Sona Mirzə qızı fevral 1992-ci ildə Zəngilan şəhəridə vəfat etmişdir.

## Hüsüyev Aslan Məhəmməd oğlu



Hüsüyev Aslan Məhəmməd oğlu 1930-cu il aprel ayında Zəngilan rayonunun Pirçivan kəndində anadan olub. İlk və orta təhsilini Pirçivan kənd məktəbində alıb. Orta məktəbi bitirdikdən sonra Kooperatif texnikumuna daxil olan Aslan Hüsüyev oranı bitirib.

Texnikumu bitirdikdən sonra rayona qayıtmış və ömrünün sonuna kimi Rayon İstehlak Cəmiyyətində müxtəlif vəzifələrdə işləmişdir.



**Hüsüyev Aslan həyat yoldaşı Cəvahir xanımla**

O Tovuz rayonundan olan Səriyyə adlı xanımla ailə həyatı qurub. Onların bu evlilikdən 3 övladı, iki qızı və bir oğlu olub. Qızlarının adı Sevinc və Leyla, oğlunun adı isə Sahib olub.

1981-ci ildə oğlu Sahibin doqquz yaşı olanda Aslan Məhəmməd oğlu həyat yoldaşını itirib. Aslan Hüsüyev dünyasın dəyişənə kimi bir daha ailə həyatı qurmayıb övladlarına həm ata həm ana olub.

Hüsüyev Aslan Məhəmməd oğlu 1992-ci il mart ayında ürək tutması nəticəsində dünyasını dəyişib. Allah rəhmət eləsin.

Mən 1971-ci ildən 1974- cü ilə kimi RİC-də fəhlə işlədim.

İşlə əlaqədar bəzən idarəyə getməli olurdum. Aslan dayını həmişə sakit, öz işinin bilən biri kimi tanıyırdım.

**Hüsüyev Hüsü Həsən oğlu**



Hüsüyev Hüsü Həsən oğlu 1918 -ci ildə o vaxtkı Rusiya İmperiyasının Zəngəzur qəzasının Məlikli kəndində anadan olub. Atasını erkən itirdiyindən ona el arasında bəzən anasınınn adına xitabən Gülgəz oğlu Hüsü deyirdilər.

Onun doğulduğu Məlikli kəndi barlı bərəkətli torpağı, saf insanları ilə bölgənin öndə gələn kəndlərindən idi. Sovet hakimiyyəti illərində bu kənddən onlara elm, sənət, partiya dövlət adamı yetişib. Hüsü dayı da onlardan biridi.

Bir çoxları kimi o, da tariximizdə vətən müharibəsi kimi bilinən 1941-1945-ci illərin ağır dövrünü yaşayıb, cəbhədə alman faşizminə qarşı vuruşub. Müharibə illərində o Fərəmnəz Paşayev, Çöpədərəli Məhərrəm Məhərrəmovla bir yerdə olub.

Müharibədən yaralı və zabit kimi qayıdıb. Qayıtdıqdan sonra onu bir partiya fəalı kimi Astraxanbazar (indiki Cəlilabad) rayonuna partiya işinə, daha doğrusu rayon Komitəsinə II katib gön-

dərmişlər. O burada layiqincə öz vəzifəsini yetinə yetirmişdir.

Sonra doğulduğu rayona qayıdan Hüsü Həsən oğlu o illərdə ən mühüm təşkilatlardan biri olan MTS-də 5 il (Maşın Traktor Stansiyası) partiya təşkilatı katibi, sonra torpaq şöbəsinin müdiri işləyib.

Hüsü Hüsüyev işdən ayrılmadan təhsili ilə də maraqlanıb və qiyabi yolla Azərbaycan Dövlət Universitetinin biologiya fakültəsini bitirib.

Hüsüyev Hüsü Həsən oğlunun deyərdim ki, ən çox hörmət qazandığı sahə 20 ilə yaxın öz doğulduğu kəndi də birləşdirən Lenin adına kolxoza rəhbərlik etdiyi illər olub. Ümümiyyətlə o harada işləməyindən asılı olmayaraq elinin dərdinə qalıb, elə eli də onu unutmayıb.

Dahi sovet rəhbəri Leninin adını daşıyan məntiq ilə baxsaq gərək qabaqcıl təsərrüfat ola, digərlərinə nümünə göstərə. Axı o rəhbərin adını daşıyırdı. İclaslarda yüksək tribunalardan Leninin adına tənqidi çıxış eləmək olardımı?

Hüsü Həsən oğlu işlədiyi bu illər ərzində dövlətin tələb etdiyi plan və tapşırıqları yerinə yetirib. Bunun üçün o çalışmasa da onun əməyini yüksək qiymətləndirmişlər. O 1948-ci ildə « Qırmızı Bayraq» Ordeni, sonralar isə medallarla, «Fəxri Fərman» larla təltif olunub. Mənə elə gəlir ki, bu günkü günün gözü ilə baxanda Hüsü dayının ən böyük mükafatları xalqın rəğbətini qazanmasıdı.

O dövlət planlarını yerinə yetirməklə yanaşı əhalinin də güzəranını, yaşayışını heç zaman yaddan çıxarmayıb. Eli, obası üçün əlindən gələni eləyib. Oxçu çayının üzərində salınan asma tros körpü məhz onun birbaşa səyi ilə tikilib. Kolxozlar arasında ilk telefon stansiyasını, hamamı da tikdirib. Ərazidə o arıçılıq, quşçuluq təsərrüfatı açmışdı. Lakin bəzi qüvvələr bunu işlətməyə imkan vermədiyindən fəaliyyətini elə ilk dövrlərdə dayandırıb. Məlikli kəndinə içməli suyu da o çəkdirib. Bunların hamısı digər təsərrüfatlara baxanda burada ən yaxşı halda idi. İstər məktəb olsun, istər klub, istərsə, hamam istərsə də dəyirman. Hamısı yerli

yerində idi.

Kolxoz sədrliyindən getdikdən sonra o rayon baş keyfiyyət müfəttişi işləyib. Sonrakı illərdə Kommunal təsərrüfatı şöbəsinin müdiri olub. Onun son iş yeri isə Ət tədarükü idarəsi oldu.

Hüsüyev Hüsü Həsən oğlu Bağırova Firəngiz Kərim qızı ilə ailə qurmuş və onların 4 oğlu, bir qızı olmuşdur. Övladları bunlardır.

Yusif, Çimnaz, Oqtay, Elbrus, Elxan.

Hüsüyev Hüsü Həsən oğlu 1996-cı ilin avqust ayında Sumqayıt şəhərində dünyasın dəyişmişdir. Allah rəhmət eləsin.

**Yazıda Adif Ağayevin yazısından istifadə olunub**

**Asif Bağırovun** dedikləri: Hüsü müəllim böyük bacım Firəngizin yoldaşı olduğundan böyük qardaşım Şamını tanımadan əvvəl onu tanıyırdım. Şamı 1952-ci ildə ordudan tərxis olunduqdan sonra onu tanıdım. Bacım Səlbi, qardaşım Şəhriyar ona qağa deyə müraciət edərdilər. Biz Şamıya da qağa deyərdik.

Hüsü müəllim olduqca təmiz və işgüzar adam idi. Vaxtı ilə həm Cəlilabad, həm də Zəngilan rayonlarında raykomun büro üzvü olmuşdu.

Böyük Vətən müharibəsi adlandırılan II Dünya müharibəsində uzun bir döyüş yolu keçmişdir.

Mənim xatirimdədir ki, 1961 ci ildə Abbas Əliyev I katib işləyəndə Hüsü qağa raykomun büro üzvü idi. Onun rəhbərlik etdiyi Lenin adına kolxoz onun sədrliyi zamanında ən qabaqcıl kolxoz olub və ən nümunəvi təsərrüfatlardan birinə çevrilmişdi.

Rəhmətlik Adif Ağayevin onun haqqında «Cəza və Qanun» qəzetində yazı dərc etdirəndə oradakı faktların çoxunu mən ona vermişdim. Yazının qəzetdə getmə xərcini isə bacımın rəhmətlik oğlu Oqtay çəkmişdi. Hüsü Hüsüyev Azərbaycan SSR Ali Sovetinin deputatı ola bilərdi.

Saxta plan və öhdəliklərdən imtina etdiyinə görə bu iş baş tutmadı. Onun müharibədə və dinc quruculuq illərində nə qədər

Orden və medalları var idisə kiçik bir çemodanda saxlardı (bacımın sonbeşik oğlu Elxanın dediyinə görə), heç vaxt sinəsinə vurmazdı. O rüşvət almazdı. Hər yerdə olduğu kimi Zəngilanda da sürücülərə təzə avtomobil verəndə idarə və müəssisə rəhbərləri 1000 manat rüşvət alardılar. Hüsü müəllim heç vaxt belə hərəkət etmədi. Sədrlik etdiyi 5 kəndin camaatı bunu yaxşı bilirdi.

Bir dəfə İçəri Müşülanlı rəhmətlik Ağaya təzə «QAZ 52» markalı avtomobol verirlər. Bunu Hüsü müəllim vermişdi. Ağa da 500 manat pulu bir tay corabın içərisinə yığıb Hüsü müəllimin evindəki çarpayıların birindəki yorğanın altına qoyub evdən çıxarkən Elxan bunu görmüş və bacıma xəbər vermişdi. Ağa həyətdən çıxmadan onu geri çağırıb pulunu özünə qaytarırlar.

Bir dəfə də mən onlarda olanda İçəri Müşlanlı Yasəmən xala (sürücü İbrahimin anası) Hüsü müəllimgilə İbrahimə təzə maşın verdiyinə görə bir hinduşka gətirmişdi.

Yasəmən xala, dedi ki, bilirəm Hüsü qardaş pul götürməz, ona görə bunu gətirdim.

Günorta vaxtı idi, Hüsü qağam da günorta fasiləsinə gəlmişdi. İşdən hali oldu və dedi ki, payı qaytarmazlar, əziyyət çəkib gətirmisiniz, çox sağ olun.

Hüsü müəllimin evi hamının üzünə açıq idi. Bir gündə 5-6 dəfə süfrə açıb yığırdılar. Qapılarında böyük bir Qaraağac var idi.

Yaz-yay aylarında bir həyətdə yaşayan Mehti Babayev (Hüsü müəllimin əmisi oğlu) ailə və uşaqları ilə, Hüsü müəllimin qardaşı Əhməd də ailə və uşaqları ilə günorta və axşam tərəfi sürfələrini həmin Qaraağacın kölgəsində salırdılar.

Kimin nəyi var idisə ortalığa qoyardı. Hər kəsin qabından hərə bir tikə götürərdi. Bəzən orada 3 samovar qaynardı.

Hüsü müəllim ləyaqətli rəhbər olduğu qədər bacarıqlı bir bioloq idi. O ərazidəki məhşur Paşa bağında müxtəlif meyvələr əkərək təxminən onu iki dəfə böyütmüşdü.

O meyvələrin çoxu Məliklidə yox idi. Onun qapısında şabalıd

ağacı da var idi. Bir neçə il sonra bar verdi. O meyvədən mən də daddım.

Məlikli və onun adamları mənim üçün doğma idi. Xüsusilə Hüsü qağamın ailəsi, evi.

## Göycəyev Xanməmməd Yarməmməd oğlu



Göycəyev Xanməmməd Yarməmməd oğlu 1929- cu ildə indiki Zəngilan rayonunun Səfərli kəndində anadan olub.  Erkən yaşında atasın itirən Xanməmmədi anası böyüdüb.

İlk təhsilini kənd məktəbində almışdır. Sonralar maddi çətinlik səbəbindən məktəbu buraxaraq əmək fəaliyyətinə başlayıb.

Hərbi xidmət yaşına çatanda Sovet Ordusu sıralarına çağırılan Göycəyev Xanməmməd Yarməmməd oğlu 4 il xidmət etmişdir. Ordudan tərxis olunduqdan sonra Mincivan dəmiryolu stansiyasında əmək fəaliyyətini davam etdirmişdir.

Göycəyev Xanməmməd Yarməmməd oğlu 1951- ci ildə dülgərlik peşəsinnə yiyələnmiş və o vaxtdan 1993-cü ilə kimi rayon tikinti-təmir idarəsində dülgər işləmişdir. Onun 8 övladının 6- sı ali təhsil almışdır.  Onlar Bakı şəhərində müxtəlif təşkilatlarda mühəndis kimi işləyirlər. Bir övladı müəllimə, digəri isə mühasibdir.

Böyük oğlu Rasim IV sinifdə oxuyarkən nümunəvi şağırd kimi Maarif şöbəsi tərəfindən seçilərək Vyetnam Demokratik Respublikasına göndərilmiş və ona mavi qalstuk mükafatı verilmişdir.

Həyat yoldaşı İsmayılova Şamama Heydər qızı 1932-ci ildə rayonun Nəcəflər kəndində anadan olub. Rayonda ASB xidmətçi işləyib.

Onlar rayonun işğalından sonra Bakı şəhərində məskunlaşmışlar.

Göycəyev Xanməmməd Yarməmməd oğlu 2006 -cı ildə, Şamama xanın isə 2011-ci ildə dünyasını dəyişib.

**Usta Xanməmməd Yarməmməd oğlu haqqında düçüncələrim**

Usta Xanməmmədin anası Hürü xalanı, yoldaşı Şamama xanımı lap kiçik yaşlarımdan tanıyırdım. Məhəlləmizin ən sakit, mehriban insanları idilər. Onlar sağ ikən özlərinə rəhmət qazanmışdılar. Xanməmmədin atalığı Məmmədbağır dayı böyük qardaşlarım Şamı ilə Şəhriyarın kirvəsi idi. Mən çox-çox sonralar bildim ki, Xanməmməd Məmmədbağır kirvənin oğulluğudur. Xanməmməd analığı Nənəxanım xalaya, onun qızı Solmaz xanıma oğul və qardaş idi. Doğrusu budur ki, heç doğmaların çoxunda belə istiqanlılıq yoxdur. O və Şamama xanım bizə, biz də onlara ,,kirvə,, deyə müraciət edirdik. Xanməmməd həm rayonda, həm də məhəlləmizdə böyük hörmət sahibi idi, olduqca nümunəvi ailəydi. Heç kimdən qeybət qırmaz, heç kimin arxasınca pis söz danışmaz, xeyirə-şərə yarayan istiqanlı adamlardı. İşini mükəmməl bilən usta idi..

Övladları da özləri kimi idi, həm tərbiyəli, həm sakit, həm də çalışqan. Hamısı da əla və yaxşı oxuyan olduğuna görə ali təhsil almaq onlar üçün problem olmadı. Ailənin böyük oğlu Rasim barədə bir fakt yadıma düşdü. Orta məktəb müəllimlərindən biri ona deyir ki, sən İnstituta girə bilməzsən. Rasim elə həmin il ali məktəbə qəbul olub, tələbə biletini həmin müəllimə göstərərək: -Bax, görürsən? Mən qəbul oldum, amma orada oxumayacağam. Ayrı ali məktəbə qəbul olub orada oxuyacağam. Rasim dediyinə prinsipiallıqla əməl edib. Xanməmmədin bütün övladlarının toyunu mən aparmışam, qonşular orada canla-başla iştirak edirdilər. Kaş hamının belə qonşuları ola**! Asif Bağırov**

## İbadov Baloğlan Bəylər oğlu



İbadov Balğolan Bəylər oğlu 1928-ci ildə Zəngilan rayonunun Nəcəflər kəndində anadan olub. Hərbi xidmətdən sonra Pirçivan kəndində yaşamağa qərar verən İbadov Baloğlan rayonun işğalına kimi tikinti-təmir idarəsində şəhərimizin küçələrinə asfalt salınması sahəsində az əmək sərf etməyib. Demək olar ki, şəhərin bütün küçələrinə onun başçılıq etdiyi briqada yayın istisində də, qışın soyuğunda da bu işi yerinə yetirib. Elə bir Zəngilanlı tapmaq olmaz ki, Baloğlan dayının döşədiyi asfaltın üzərində gəzməsin, yeriməsin.

Burada o uzun illər tikinti-təmir sahəsində şalışmışdır. Onun əmək kitabçasından müəyyən qeydləri sizə çatdırım. 01.01.1945-ildən radio qovşağında işçi kimi əmək fəaliyyətinə başlayıb. 1949-cu ilin 26 oktyabrında isə asfalt beton zavoda 3-cü dərəcəli fəhlə kimi işə qəbul olunub. 17 aprel 1964-cü rayon Kommunal təsərrüfat şöbəsində təmir sahəsi üzrə 4 dərəcəli asfalt salan işləyib.

1962 ci ildə Zəngilan qiyabi orta məktəbini bitirib.

İbadov Baloğlan Bəylər olğlu 30.01.1974 «Sosializm yarışışnın qalibi döş nişanı, 1970-ci ildə «Lenin» yubiley medalı və 1983 də «Əmək veteranı» medalları ilə təltif olunub.

18 iyul 1988 təqaüdə çıxıb və eyni zamanda 2 dərəcəli fəhlə kimi yenə işləyib. 08 may 1992-ci ildə işdən tam azad olunan Baloğlan İbadov 2003-cü ildə Şirvan şəhərində vəfat etmişdir.

Baloğlan İbadov Azərbaysan SSR Ali Sovetinə və yerli sovetlərə keçirilən seçkilərdə bir neçə dəfə rayon dairə komissiyasının sədri olub

**İsmayılov İsmayıl Süleyman oğlu**



İsmayılov İsmayıl Süleyman oğlu 1909-cu ildə Zəngəzur qəzasının Məmmədbəyli kəndində anadan olub. Gəng yaşlarından şəxsi təsərrüfatlarında çalışıb, hələ cavan ikən el arasında özünə hörmət qazanmışdır. 1920-ci ildə Azərbaycanda Sovet hakimiyyəti qurulduqdan sonra o da bu quruluşunun fəallarından birinə çevrilmiş kolxoz təsərrüfatında əmək fəaliyyətini davam etdirmişdir. 1931-ci ildə bir çoxları kimin o da Kolxoza daxil olmuş, dövrün önəmli təşkilatlarından olan komsomol fəalı olmuşdiur.

Özünü bacarıqlı və təşkilatçı kimi göstərən İsmayıl İsmayılovu 1940-cı ildə dövrün aparıcı qüvvəsi olan kommunist partiyası sıralarına qəbul etmişlər. İşinə diqqətlə yanaşan gənc fəalın istək və arzularını 1941-ci ildə başlayan amansız müharibə müvəqüəti də olsa dayandırmışdır.

1941-ci ilin avqustunda cəbhəyə göndərilən Süleyman Süleymanov 226 -cı s.p tərkibində ağır döyüşlərdə iştirak etmiş, 1943 -cü ildə ağır yaralandığından ordudan tərxis olunmuşdur. Doğma kəndinə qayıtdıqdan sonra yenidən rayonun ən böyük təsərrüfatlarından biri olan «Bakı fəhləsi» kolxozunda işinə davam etmişdir.

İsmayılov İsmayıl cəbhədəki qəhrəmanlığı yüksək qiymətləndirilmişdir. O, 07 may 1965-ci ilə Qələbənin 20, 1967-ci ildə SSRİ Silahlı Qüvvələrinin yaradılmasının 50, 1985-ci ildə Qələbənin 40, 1988-ci ildə isə Silahlı Qüvvələrin yaradılmasının 70 illik yubiley medalları ilə təltif olunmuşdur. 12 aprel 1985-ci ildə isə ona ən yüksək hərbi ordenlərdən sayılan I dərəcəli Vətən Müharibəsi Ordeni verilmişdir.

El ağsaqqalı, torpağını, elini ürəkdən sevən İsmayıl kişi ömrünün ixtiyar vaxtında doğma kəndini, yurdunu məcburi tərk etmiş və Sumqayıt şəhərinə pənah gətirmişdir Bir çoxları kimi o da

bu ağır niskillə batışa bilməmiş, eli üçün, yudru üçün döyünən ürəyi 02 aprel 1994-cü ildə dayanmış, bu dünyadan köçmüşdür. Allah rəhmət eləsin. Onun Koroğlu Süleymanov kimi qeyrətli, elini sevən, elə adına yaraşan övladı var.

Yazıda Mütəllim Həsənovun «Qərib məzarlar» kitabından istifadə olunub.

**İsmayılova Xanım Ələkbər qızı**

*(Zəngilan rayon XDS Deputatı,*
*Azərbaycan KP XXXI qrultayının nümayəndəsi)*



İsmayılova Xanım Ələkbər qızı 25 fevral 1957-ci ildə Zəngilan rayonunun Malatkeşin kəndində anadan olmuşdur. Orta təhsilini Malatkeşin kənd orta məktəbində almışdır. Orta məktəbi bitirdikdən sonra «Kalinin» adına Sovxozda işləməyə başalamışdır.

1979-cu ildə Gəncə (o illərdə Kirovabad adlanırdı) şəhərindəki Kənd Təsərrüfatı Texnikumuna daxil olmuş 1981-ci ildə oranı «Aqronomluq» ixtisası üzrə bitirmişdir.

Xanım İsmayılovanın atası Ələkbər də aqronom idi. Atasının yolu ilə gedən gənc Xanım Ələkbər qızı sovxozda sağıcı kimi əmək fəaliyətinə başlamışdır. Işinə diqqətlə yanaşmış dövlətin plan və tapşırıqlarını vaxtında və artıqlaması ilə yerinə yertirmişdir.

Onun əməyinə qüksək qiymət verilmiş rayon, eləcə də Respublika miqyaslı tədbirlərdə dəfələrlə iştirak etmişdir.

Xanım İsmayılova bir meçə çağırış Zəngilan rayon XDS-nin deputatı seçilmiş, Zəngilan rayon partiya komitəsinin üzvü olmuşdur. O rayonda işlədiyi təsərrüfatı laqiqincə təmsil etdiyi kimi Respublika miqyasında da rayonumuzu təmsil etmişdir.

O Bakı şəhərində keçirilən Respublika kənd təsərrüfatı qabaq-

cıllarının müşavirəsində dəfələrlə iştirak etmişdir.

İsmayılova Xanım Ələkbər qızı eyni zamanda bir partiya fəali kimi rayonumuzu o dövrün Ali Partiya məclisi olan və 1986-cı ildə keçirilən Azərbaycan Kommunist Partiyasının XXXI qurultayında təmsil etmişdir.

Dövlətimiz onun əməyini yüksək qiymətləndirmiş, o «Əməkdə igidliyə görə» medalı ilə təltif olunmuş, bir çox «Fəxri Fərman», təşəkkür və pul mükafatı ilə mükafatlandırılmışdr.

Rayonda nəşr olunan «Kənd Həyatı» (indiki «Zəngilanın səsi») qəzetində yazıçı Əli İldırımoğlu Xanım İsmayılova və onun zəhmətkeş bacıları haqqında «Bacılar» adlı oçerk dərc etmişdir.

Xanım İsmayılova Şayıflı kənd sakini Zakir Quliyev ilə ailə həyatı qurmuşdur. Onların üç övladı dünyaya gəlmişdir. Qızları Natəvan, Aynur və oğlanları Azər.

1993-cü ildə mənfur düşmənin başladığı elan olunmayan müharibə nəticəsində gənc ailə digər elliləri kimi həyatlarının çiçəklənən dövründə köçkünlük həyatı yaşayırlar. Xanım İsmayılova ailəsi ilə birlikdə Əli Bayramlı (indiki Şirvan) şəhərində məskunlaşır. Burada onlar köçkünlük həyatının çətinliklərinə baxmayaraq bir-birinə dayaq olaraq Natəvan, Aynur, Azəri vətənə layiq övladlar kimi yetişdiriblər. Hər üçüdə yaxşı tərbiyə, təhsil alaraq cəmiyyətdə bir vətəndaş kimi öz yerlərini tutublar.

Beş qız və iki oğul nəvəsi vardır. Oğul nəvəsi Yasif isə qaynı Birinci Qarabağ müharibəsi Şəhidi Yasif Quliyevin adını daşıyır.

Yoldaşı Zakir Quliyev yurd həsrəti ilə dünyadan köçsə də Xanım İsmayılova artıq azad olunmuş yurdu Zəngilana qayıdaraq doğma elinə yenidən öz tövhəsini verməyi səbirsizliklə gözləyir.

**Xəyyam Əliyev**

## Kazımov Voroşil Loğman oğlu

*İlk zəngilanlı memar*

Kazımov Voroşil Loğman oğlu 1938-cı ildə Pirçivan kəndində anadan olub. 1953- cü ildə Pirçivan kənd orta məktəbini bitirmişdir. Voroşilın adı sizlərə qəribə gələr. Məlumat üçün bildirim ki, atası Loğman Kazımov SSRİ-nin ilk marşallaraından olan K.Y Voroşilovun xatirəsinə oğluna onun familiyasın verib.

Voroşil Kazımov orta məktəbdə oxuduğu illərdə Pirçivan kəndinin yığma futbol komandasının əsas oyunçularından olub. O hücüm xəttində oynayıb. Kazımov Voroşil Loğman oğlu orta məkrtəbi bitirdikdən sonra Azərbaycan Politexnik İnstitutuna daxil olmuş və oranı memarlıq ixtisası üzrə bitirmişdir.

Ali məktəbi bitirdikdən sonra Bakı şəhərində yaşamağa qərar verən Voroşil uzun illər müxtəlif lahiyə institutlarında adi memarlırdan müəssisəninin direktoruna kimi yüksəlmişdir. Zəngilan şəhərinin ilk baş planının çəkilməsində o həmin qrupun rəhbəri kimi onun altına öz imzasın atmışdır.

Kazımov Voroşil Loğman oğlu Bakı şəhərində vəfat etmişdir.

## Kərimov Ədil Hətəmxan oğlu

*1941-1945-ci illər müharibəsinin iştirakçılarından*
*Zəngilanın milis starşinası*



Kərimov Ədil Hətəmxan oğlu 1924-cü ildə Zəngilan rayonunun Çuxuryurd kəndində anadan olub. Onlar üç qardaş iki bacı olmuşlar. Ədil Kərimov ibtidai təhsilini Qaragöl kənd məktəbində almış sonra isə Keçikli kənd məktəbinin 7 sinfini bitirmişdir.

Kərimov Ədil Hətəmxan oğlu 1941-1945-ci illər müharibəsində döyüşən orduda iştirak etmişdir. Onun döyüş yolu Qudurmes, Voro-

nej və digər şəhərlərdən keçmişdir. Müharibədə döyüşlərin birində ağır yaralanan Ədil Kərimovu müalicə almaq üçün hərbi hospitala göndərmişlər. Müalicə olunduqdan sonra həkimlər onun orduya yarasız olduğu qənaətinə gəlmiş və onu ordudan tərxis etmişlər. Rayona qayıdan Ədil Kərimov bir müddət kolxoz təsərrüfatında işlədikdən sonra 1945-ci ildə milis sisteminə işə qəbul olunub.

Ədil Kərimov bu sistemdə düz 40 il xidmət edib. 1985 ci ildə təqaüdə çıxandan sonra da əmək fəaliyyətini davam etdirmişdir. O rayon İstehlak Cəmiyyətinin veteranlara məxsus mağazasında əmək fəaliyyətini davam etdirmişdir. Ədil Kərimov Zəngilanda starşina kimi də tanınırdı.

Ədil Hətəmxan oğlu Kərimov işlədiyi müddət ərzində bir çox medal və «Fəxri Fərman» larla təltif olunub.

O rayonun işğalından sonra Bakı şəhərinin Abşeron rayonunun Məmmədli kəndində məskunlaşmış 2010 cu ilin 10 martında dünyasını dəyişmişdiur. Ədil Kərimovun 7 övladı, 18 nəvəsi, 26 nəticəsi var. Allah rəhmət eləsin.

Onun haqqında mən də həmişə xoş sözlər eşitdim. Sanki heç sistem işçisi deyildi. Bu, onun əhaliyə olan diqqət və qayğısının nəticəsi idi

## Qocayev Məsud Şəmşi oğlu

*Həkim*



Qocayev Məsud Şəmşi oğlu 10 may 1940-cı ildə Zəngilan rayonunun Orta Yeməzli kəndində anadan olub. Atasının adı Şəmşi, anasının adı isə Zəhradı. İki yaşı olanda atası Şəmşini səfərbərliyə alıb, 1941-1945-ci illər müharibəsinə yollamışlar. Müharibədə iki il vuruşmuş, 1944-cü ildə həlak olmuşdur. Onlar ailədə üç qardaş olublar: Fərrux, Xasay və Məsud. Ailə-

nin son beşiyi olan Məsud ilk təhsilini Sarallı Xəştab kənd məktəbində alıb.

Qocayev Məsud Şəmşi oğlu 1946-cı ildə Yeməzli kənd ibtidai məktəbin I sinfinə gedib. 1950-cı ildə isə Sarallı Xəştab məktəbində oxumağa davam edib. Burada 7-ci sinfi bitirdikdən sonra Gilətağ kənd orta məktəbinə getmişdir. O illərdə Zəngilanın ən böyük məktəblərindən olan Gilətağ kənd orta məktəbini bitirmişdir. Orta məktəbi bitirdikdən sonra ali məktəbə daxil ola bilməyən Məsud Qocayev növbəti il Kirovabad (indi Gəncə) şəhərinə gedərək ortadakı S.Ağamalıoğlu adına Azərbaycan Kənd Təsərrüfatı İnstitutunun hazırlıq şöbəsinə daxil omuşdur. Sonrakı il İnstitutun Baytarlıq şöbəsinə daxil olmuş və bir il oxumuşdur. Burada bir il oxuduqdan sonra sənədlərini geri alıb, Azərbaycan Dövlət Tibb İnstitutuna vermiş və qəbul olmuşdur. Həmin ali təhsil ocağının Müalicə profilaktika fakültəsini 1966-cı ildə bitirmişdir.

Ali məktəbi bitirdikdən sonra onun təyinatını Abşeron rayononunun Şurabad kəndinə verirlər. Burada altı ay işlədikdən sonra Sumqayıt şəhərinə gəlir və burada müalicə həkimi kimi əmək fəaliyyətini davam etdirir. Sonra daha doğrusu 1970-ci ildə Qocayev Məsud Şəmsi oğlu doğulduğu rayona qayıtmış və Zəngilan rayonu Gilətağ kənd xəstəxanasına baş həkim təyin olunub.

Qocayev Məsud Şəmsi oğlu 1971-ci ildə ailə qurmuş və elə həmin ildə də Zəngilan şəhərinə köçmüşdür. Burada o laboratoriya şöbəsinin müdiri kimi işinə davam etmişdir. Onun rayonun işğalı zamanı son iş yeri Zəngilan rayon Mərkəzi xəstəxanası idi. İşğaldan sonra yenidən Sumqayıt şəhər poliklinikasında laborant həkim kimi çalışmışdır. 1994-1995- ci illərdə Sumqayıt Tibb Texnikumunda saat hesabı ilə dərs demişdir. Qocayev Məsud Şəmsi oğlu 08 avqust 1995-ci ildə vəfat etmişdir. Onun 4 oğlu bir qızı var.

-oğlu Murad 09 noyabr 1972-ci ildə Zəngilan şəhərində anadan olub. Yoldaşı Bağırova Aytəkin Asif qızıdı. Onların Aysu, Ayan adlı qızları, Məsud adlı oğlu var.

-oğlu Barat 15 sentyabr 1974-cü ildə Zəngilan şəhərində anadan olub. Azərbaycan Dövlət Tibb İnstitutunu bitirib. Subaydı.

-oğlu Polad 26 noyabr 1976-cı ildə Zəngilan şəhərində anadan olub. Azərbaycan Dövlət Politexnik İnstitutunu bitirib. Subaydı.

-qızı Vüsalə 05 aprel 1979-cu ildə Zəngilan şəhərində anadan olub. Ailəlidir Ayxan və İbrahim adlı oğlu var.

-oğlu Asif 17 noyabr 1983-cü ildə Zəngilan şəhərində anadan olub. Evlidi Nihat, Ömər adlı oğlu, Yelena adlı qızı var.

**Qafarov Məmməd Sadıq oğlu**

*1 saylı şəhər Orta məktəbinin idman müəllimii*



Qafarov Məmməd Sadıq oğlu 1935-ci ildə rayonun Ördəkli kəndində anadan olub. Azərbaycan Bədən Tərbiyəsi İnstitutunu bitirmişdir. Məmməd Qafarov uzun illər 1 saylı şəhər orta məktəbində bədən tərbiyəsi müəllimi işləmişdir.

Mənim orta məktəbdə oxudum illərdə yəni 1969-1971- ci illər Məmməd müəllim bizim bədən tərbiyəsi və idman müəllimimiz idi.

Məmməd Sadıq oğlu Qafarov işğaldan sonra Bakı şəhərində vəfat etmişdir. Qafarov Məmməd Haşıım oğlu müəllim və şagird kollektivi arasında böyük hörmət qazanmışdı.

## Qocayev Mürsəl Eyvaz oğlu



Qocayev Mürsəl Eyvaz oğlu 21 mart 1926-cı ildə indiki Zəngilan rayonunun Sarallı Xəştab kəndində (bu kənd 1963-cü ilə kimi Qubadlı rayonunun inzibati ərazisinə daxil idi) anadan olmuşdur.

Atası Eyvaz kişi əsrin əvvəllərində bir müddət Bakı şəhərində fəhlə işləmişdir. Ancaq bu həyata uyğunlaşa bilmədiyindən rayona qayıtmışdır. Bir müddət sonra o Zülfü Əhmədovun bacısı Tubu Şahvələd qızı ilə evlənmişdir. Bu evlilikdən onlarım iki qızı (Telli və Sirtatel) və beş oğlu (Mürsəl, Əli, Vəli, Səməd və Vaqif) olub. Mürsəl müəllim onların ikinci övladı və ilk oğulları idi. Eyvaz kişi 1963- cü ildə vəfat etmiş və Sarallı Xəştab kənd qəbiristanlığında dəfn olunmuşdur.

İlk təhsilini kənd məktəbində alan gənc Mürsəl ibtidai məktəbi qurtarıb qonşu kənddəki orta məktəbə gedəndən sonra 6–cı sinifdə oxuyarkən bir qrup məktəbli ilə birlikdə əlaçıların rayon toplanışına aparılmışdır.

Faşist Almaniyasının SSRİ-yə qəflətən hücuma zamanı müharibə başlandığından (1941-ci ildə) bir neçə şagirdlə bərabər Bakı şəhərində peşə öyrənməyə göndərilmişdir. Bakı şəhərindəki 10 saylı Texniki Peşə Məktəbini tornaçı (tokar) ixtisasını bitiridikdən sonra o vaxtkı Kirov (indiki Binəqədi) rayonunda olan hərbi zavodda bir müddət işləmiş, sonra kəndə getmiş və bir il kolxoz təsərrüfatında çalışmışdır, 1943-cü ildə yenidən Bakıya gedən Mürsəl müəllim Binəqədi neft trestinin dəqiq ölçü alətləri sexində işləmiş, eyni zamanda axşam fəhlə-gənclər orta məktəbində təhsini davam etdirərək orta təhsil alıb.

1944-cü ildə indiki N. Tusi adına (o vaxtkı V.İ.Lenin adına) Azərbaycan DPİ-na daxil olub, 1948-ci ildə oranın dil-ədəbiyyat fakultəsini müvəffəqiyyətlə bitirmişdir. Ali məktəbi bitirdikdən

sonra onu doğulduğu rayona müəllim göndərmişlər.

O, altı il Zəngəzurda, əsası 1884-cü ildə Qubadlı orta məktəbində əvvəlcə müəllim, sonralar isə tədris hissə üzrə direktor müavini işləmişdir. Bu barədə Mürsəl müəllim həmin məktəbin 125 illik yubileyində belə deyib:

- Bu barədə danışmaq mənə ona görə xoşdur ki, bu məktəb mənim həyatımda unudulmaz izlər buraxmışdır. 1948-ci ildə API-ni qurtaranda ilk təyinatım bu məktəbə olmuşdur. 3 il bu məktəbdə dil – ədəbiyyat müəllimi, 2 il yarım isə təlim-tərbiyə işləri üzrə direktor müavini işləmişəm. 1955-ci ildə rayon partiya komitəsinə şöbə müdiri vəzifəsinə irəli çəkilmiş, 1957-ci ildə rayon qəzetinə redaktor təyin olunmuşam. Sonra Cəbrayıl rayonlararası qəzetdə işləmiş, 1963-cü ildən Zəngilan rayonlararası qəzetə redaktor təyin olunmuşam.

1942–ci ilin iyul ayında məni FZO–ya (peşə məktəbinə) səfərbərliyə aldılar. Həmin məktəbi qurtarandan sonra isə Binəqədineft trestinin KİP (dəqiq ölçü cihazları) zavodunda xidmət çilingəri işləməyə başladım, həm də axşam fəhlə–gənclər orta məktəbində təhsilimi davam etdirdim.

1944–cü ilin ortaları idi. Sənət məktəbinin müdavimi kimi Binəqədi Neft Trestinin dəqiq ölçü alətləri sexində buruqlardakı ölçü cihazlarına xidmət çilingəri işləyir, həm də axşam orta məktəbində təhsilimi davam etdirirdim

Sovet hökümətinin əsas silahlarından biri də təbliğat idi. Məhz bu səbəbdən də Mürsəl müəllimi bacarıqlı bir kadr kimi 1955-ci ilin yanvarında Qubadlı rayon partiya komitəsində ideoloji şöbə müdiri vəzifəsinə irəli çəkirlər. Sonra 1957-ci ilin oktyabrında isə rayonda nəşr olunan «Avanqard» qəzetinin redaktoru təyin edilmişdir.

1963-cü ildə Qubadlı rayonu Zəngilan rayonu ilə birləşdirilmiş Zəngilan, Qubadlı, Cəbrayıl rayonları üzrə istehsalat birliyi təşkil olunmuşdur. Bu zaman həmin birlik üzrə Azərbaycan MK və Azərbaycan SSR NS-nin orqanı kimi həftədə 4 dəfə dərc olu-

nan rayonlararası «Kolxozçu» qəzeti nəşr olunmağa başlamışdır. O, həmin qəzetin Qubadlı və Zənglian rayonlatrı üzrə xüsusi müxbiri təyin olunmuşdur.

Mürsəl Qocayev 1963-cü ildə Qubadlı, Zəngilan və Laçın rayonu üzrə rayonlararası «Kənd Həyatı» qəzeti təşkil olunarkən həmin qəzetin redaktoru təyin olunmuş və 1965-ci ildə həmin rayonlar ayrılıb özlərində qəzet buraxmağa başlanandan sonra o, «Kənd Həyatı» rayon qəzetində redaktor fəaliyyətini davam etdirmişdir. 1989-cu ilin iyul ayında redaktorluqdan könüllü surətdə təqaüdə çıxmış və jurnalistik fəaliyyətini rayon və respublika qəzetlərində vaxtaşırı məqalələr yazmaqla davam etdirmişdir.

Vaxtilə qəzetdə fəhlə - kəndli müxbiri kimi iştirak etməyə həvəs göstərən bir sıra gənclərin universitetdə ixtisas təhsili almalarına redaksiyanın zəmanəti ilə istiqamət vermişdir. Əgər 1963-cü ildə redaksiyada 1 nəfər jurnalist var idisə, onların sayı tədricən artmağa başlamışdır. Beləliklə jurnalistlərin sayı artıq qonşu rayon redaksiyaları arasında birinci olaraq Zəngilanın «Kənd Həyatı» qəzeti redaksiyasında Azərbaycan jurnalistlər birliyinin ilk təşkilatını yaratmağa imkan verir. 1980-ci illərdə 6 nəfər qiyabi, 6 nəfər isə qəzetin zəmanəti ilə əyani jurnalist təhsili almışdır.

Mətbuatda uzun illər səmərəli fəaliyyətinə görə dəfələrlə fəxri fərman və diplomlarla təltif olunmuş, «Həsən bəy Zərdabi» və «Ustad» «Ali jurnalist» mükafatına layiq görülmüşdür.

Mürsəl Eyvaz oğlu Qocayev Rayon işğal olunduqdan sonra Bakıda məskunlaşıb və «İki sahil», «525-ci qəzet», «Təzə həyat», «Proqnoz», «Kredo», «Demokratiya», «Pres fakt», «Yeni Azərbaycan», «Ədalət», «Vətən səsi», «Həyat», «Zəngəzur», «Azərbaycan müəllimi», qəzetlərində müntəzəm olaraq ədəbi-bədii, publistik məqalələr ilə çıxış etmişdir. Mürsəl Eyvaz oğlu Qocayev 2010-cu il iyulun 13-də Bakı şəhərində vəfat etmişdir.

## Quliyev İsmayıl Mehti oğlu



**Quliyev İsmayıl Mehti** oğlu 09 may 1921-ci ildə İskəndərbəyli kəndində anadan olub. Gəncə şəhərində Kənd Təsərrüfati Texnikumunu bitirən İsmayıl Quliyev eyni zamanda 1941-1945-ci illər müharibəsində iştirak etmişdir. Müharibədən sonraklı illərdə o MTS-də Baş mühəndis və s. vəzifələrdə işləyir. O bir neçə çağırış rayon XDS-nin deputatı seçilib.

Quliyev İsmayıl Mehti oğlu 28 may 2011-ci ildə Bakı şəhərində vəfat edib.

Həyat yoldaşı Əvəzova Mirvari Yəhya qızı 08 mart 1932-ci ildə rayonun Ağalı kəndində anadan olub. Mirvari xala şəhərimizdə müxtəlif idarələrdə çalışmışdır. O, 01 fevral 2016-cı ildə Bakı şəhərində dünyasını dəyişib. M.Əvəzova 5 uşaq tərbiyə etdiyinə görə I dərəcəli «Analıq Medalı» ilə təltif olunub. Onların üçi oğlu iki qızı var idi.

-oğlu **Mahir** 1956-cı ildə Pirçivan kəndində anadan olub.. 1963-1973 -cü illərdə şəhər orta məktəbində oxuyub. Bakı Dəmiryolu Texnikumunu bitirən M. Quliyev Bakı metropolitenində işləyir. Yoldaşı Mehtiyeva Sevdadır. Onların Yeganə, İsmayıl və Ülkər adlı üç övladları var.

-qızı **Nəzakət** 1957-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1964-1974-cü illərdə şəhər orta məktəbində oxuyub. Yoldaşı Orucov Kamran Məhəmməd oğludur. Onların Zaur, Gülnar və Əntiqə adlı üç övladı var.

-oğlu **Tahir** 1961–ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1968-1978-cu illərdə şəhər orta məktəbində oxuyub. Bakı Politexnik Texnikumunu bitirib. Yoladışı İmişli rayonundandır Onlaırn Ülvi və Ülviyyə adında iki övladı var.

-qızı **Aləmzər** 1962-ci ildə Zəngilan qəsəbəsində anadan

olub. 1969-1979-ci illərdə şəhər orta məktəbində oxuyub. Bakı Yeyinti Sənaye Texnikumunu bitirib. Yoldaşı Fəxrəddin Ağdamlıdır.

-oğlu **Zahir 25 sentyabr 1965 ci** Zəngilan qəsəbəsində anadan olub. 1972-1982-ci illərdə şəhər orta məktəbində oxuyub. Sonra Bakı Dəmiryolu Texnikumunu bitirib. Yoldaşı Hacıyeva Aytən Hafiz qızı əslən Şuşalıdır. Onların Nurlan, Nurlan və Kənan adlı üç övladı var.

**Quliyev Qulu Behbud oğlu**

*sabiq milis kapitanı*



Quliyev Qulu Behbud oğlu 1918-ci ildə Zəngəzur qəzasının Dərəli (indiki Zəngilan rayonu) kəndində anadan olub. İlk təhsilini kənd məktəbində alan Qulu sonralar Pirçivan kənd orta məktəbini bitirib.. Orta məktəbi bitirdikdən sonra hərbi xidmətə çağırılmış və 1936-1939 cu illərdə Qızıl Ordu sıralarında hərbi xidmət keçmişdir. 1939 cu ildə hərbi xidmətini başa vurub qayıtdıqdan sonra müharibə başladığından yenidən səfərbərliyə alınararaq cəbhəyə göndərilmişdir. 1941-1945-ci illər müharibəsində iştirak etmişdir. Mühariə illərində bir müddət Füzuli rayonunda milis sistemində işləyən Quliyev Qulu sonra Mərdəkan qəsəbəsindəki milis məktəbinə daxil olur. Məktəb bitirdikdən sonra onu Qarabağa ezam edirlər. O Şüşa, Ağdam, Füzüli rayonlarında ictimai asayişin və qayda qanunların qorunmasında fəal iştirak etmişdir. Sistemdə bir neçə il işlədikdən sonra öz ərizəsi ilə işdən azad edilmişdir.

Milis sistemindən çıxdıqdan sona o rayonda bir çox mühüm vəzifələrdə işləyib. Onun son iş yeri isə Zəngilan rayon Maliyyə şöbəsi idi. Quliyev Qulu Behbud oğlu 21 iyul 1988-ci ildə Zəngi-

lan şəhərində vəfat etmişdir.

***

Quluyev Qulu Zəngilanın ilk ixtisaslı milis (polis) əməkdaşlarından biri olub. Bu ucaboy, enlikürək insanı kim ilk dəfə görsəydi onu peşəkar idmançı, güləşçi, ağır atlet, ştanqist (ağırlıq qaldıran) hesab edərdi. Onun qüdrətli idmançılara məxsus qabarıq sinəsi, iti və sərrast yerişi, təmkinli və məntikli danışığı ilə yanaşı, yüksək mədəniyyəti, xeyirxah əməlləri onu daha da şöhrətləndirmişdi. Mən onu tanımadan əvvəl böyük qardaşı Alış dayını, əmisi oğlanları Quliyev Mədəd Məhəmməd oğlunu, Quliyev İskəndər Paşa oğlunu tanıyırdım. Bu keçən əsrin 1952-1953-cü illərinə təsadüf edir. Buna səbəb «Dardan yuxarı» deyilən Ağkənd, Dərəli, Günqışlaq, Qazançı kəndlərinin Pirçivandakı M.C.Bağlrov adına kolxoza birləşdirilməsi idi.Yuxarıda adlarını çəkdiyim adamları demək olar ki, hər gün görürdüm. Mədəd Quliyev qonşumuz idi. Onun uşaqları Fərayiz xanımla, Şahvələdlə hər gün bir yerdə kolxozun uşaq bağçasına gedirdik. Quliyev İskəndər pambıq briqadiri olduğundan kolxozun həyətindəki məntəqədə rastlaşardıq. Alış dayı, böyük oğlu Fehruzla tez tez bizə gələrdi. Onların həm xasiyyəti, həm də boy buxunu Qulu dayıya bənzəyirdi.

Mən orta məktəbdə oxuyanda Qulu dayı rayon Maliyyə şöbəsində işləyirdi. Onun el oba təəssübü çəkən, qeyrətli bir kişi olması barədə ilk məlumatı böyük qardaşım Şamı Bağırovdan eşitmişdim. O danışırdı ki, Böyük Vətən Müharibəsi bitdikdən sonra uşaqlıq yoldaşlarım Rzaxan Rzayev, Cəfər Cabbarovla GERS in yanındakı bağda mayovka keçirirdik. Süfrəmiz çaxır, balıq konservası, göy-göyərti və çörəkdən ibarət idi. Rzaxan müharibədə bir ayağını itirmişdi, Cəfərlə mən bu itkini ona unutdurmaq üçün şən zarafatlar edirdik. Məclisimizin şirin yerində Nəbiyev Şirin bizə yaxınlaşıb məni kənara çəkərək bildirdi ki, MTS-i çöl qapıdan sirquşla möhürlədilər. Bunu milisin müstəntiqi Qulu Quliyev elədi.

Mən yoldaşlarımdan yarım saatlıq icazə alaraq MTS-in idarə-

sinə gəldim. Orada mən naryadçı işləyirdim. Məni bu vəzifəyə Şəfaət Mehtiyev təyin etmişdi. Bütün işçilərin: traktoristlərin, sürücülərin pullarını mən paylayırdım. MTS-in idarə binası (baraklar) sonralar Raykomun ikinci binası tikilən yerdə idi. Qapı sirquşlu və möhürlü idi, mən nə edim? Kassada artıq pul var, onu necə çıxarım? Nəbiyev Şirin də o baraklarda yaşayırdı, oğlu Vaqif həyətdə oynayırdı, onu çağırdım, bir iki dənə konfet verdim və başa saldım ki, bu sirquşu səliqəli qapıdan qopart.

Vaqif dediyimə əməl elədi. Qapını açdım, kassadakı artıq pulları bir kisəyə yığıb MTS-in həyətindəki ot tayasının içərisində gizlədib, yoldaşlarımın yanına qayıtdım. May ayının 3-də böyük bir komissiya gəldi. Qulu Quliyevə dedilər ki, sirquş tərpənməyib? Dedi ki, mən necə vurmuşam elədir, lakin, sirquşun tərpənməyi aydın görünürdü. Bunu da hamıdan yaxşı Qulu Quliyevin özü bilirdi. Beləliklə Qulu Quliyev bir neçə adamı böyük bir bəladan qurtardı.

Qulu Quliyevin xeyirxahlığı barədə bir faktı da Qubad Bağırovun Şamı Bağırov haqqında xatirələrindən çatdırım: (Burasını bildirim ki, bu hadisə 1943-cü ilin yayında olub.O zaman Zəngilandan 22 nəfər Qaryagində (Füzulidə) müharibə ) mühasiblik və zootexniklik kursunda oxuyurmuşlar. Asif Bağırov) İyul ayının ortaları idi. Hamımızın pulu və çörəyi qurtarmışdı. Fikirləşdik ki, ya Quludan, yada Sevdayardan borc pul alaq. (Qulu Qaryagində milis şöbəsində işləyirdi, oradakı bazar da onun səlahiyyəti dairəsində idi. Sevdiyar isə Qurban Müstafayevin böyük bacısının yoldaşıydı) Şamı dedi ki, mən utanıram borc almağa. Mən (yəni Qubad Bağırov) təklif etdim ki, Aybasanlı kəndində biçilən buğda zəmisinin yerindən başşaq yığaq və döyüb buğda eləyək. Təklifim qəbul olundu. Şamı dedi ki, hamı bir nəfər kimi getməlidir. Hərəmiz bir meşok (kisə) götürüb onu doldurub, məktəbin həyətində daşla döydük, 130,140 kilo buğda oldu. Buğdaları araba ilə Sevdayar dayının işlədiyi dəyirmana apardıq. O, təmənnasız onu üyüdüb bizə verdi. Biz buğdanı ilk olaraq ba-

zarda satmaq istədik. (kisəsi 100 manat idi). Bazarkom buğdanı satmağa qoymadı. Onu bizdən zorla aldı.Bu zaman Şamı gedib Qulu Quliyevi gətirdi. Qulu bazarkomu söydü və hədələdi, buğdanı özümüzə qaytardı. Bundan sonra bizim yeməyə çörəyimiz, xərcləməyə pulumuz oldu. Qulu Quluyev yüzlərlə belə xeyirxahlıq edib, o qeyrətli bir kişi idi. Allah rəhmət eləsin.

**Asif Bağırov, yazıçı publisist.**

## Quliyev Ədil Oruc oğlu və Quliyeva Sehranə Ağabala qızı

### Xatirələrdə yaşayan nümunəvi ailə





Bu yazım Ədil Oruc oğlu Quliyev və ömür gün yoldaşı Sehranə Ağabala qızı Quliyeva haqqındadır.

Hər ikisi Zəngilanın ən qədim, həm də böyük yaşayış məntəqəsi sayılan Gilətağ kəndindəndirlər. Gilətağ kəndi dörd hissədən ibarət olmuşdur: Dağ Gilətağ, Aşağı Gilətağ, Dərə Gilətağ, Böyük Gilətağ (İydəli də deyirlər). Yuxarı və Aşağı Gilətağ kəndləri Yelizavetpol Qubeniyasının (Gəncə) Zəngəzur qəzasına mənsub olmaqla, indiki Qafan rayonunun ərazisində yerləşmişdir. Böyük Gilətağın ərazisi Xocahan (Qubadlı) bəylərinin olub. Kənd camaatı əkin sahəsi az olduğundan onu Xocahan bəylərindən satın alıb. (Ə.Sobulu) Bu dörd kəndin əhalisinin hamısı soy-kök etibarı ilə ən yaxın qohumdurlar. Gilətağ kəndi hələ Çar Rusiyası zamanında sayılıb -seçilən şəxsiyyətləri ilə məşhur idi. Qafanın bir neçə kəndini birləşdirən Gığı dərəsi və ona yaxın kənd Gilətağlı Alyar yüzbaşının səlahiyyəti dairəsində olmuşdur. Sehranə xanımın əmisi Piri kişi pristavın tərcüməçisi işləmişdir. İkinci Dünya Müharibə-

sində çox sayda Gilətağlı iştirak etmiş, onların bəzisi həlak olmuş, bəzisi isə əlil vəziyyətdə doğma torpaqlarına qayıtmışdılar. Ədilin atası Quliyev Oruc İmamqulu oğlu 1943-cü ildə Ukraynanın Zaparojye vilayətinin İvanovka kəndində şiddətli döyüşlər zamanı həlak olub, məzarı da oradadır. Sehranə xanımın atası Ağabala kişi də İkinci Dünya Müharibəsinin iştirakçısı olmuş, bir ayağını itirdikdən sonra Zəngilana qayıtmış, övladlarının tərbiyəsinə və təhsilinə həmişə diqqətli olmuşdur. Ağabala kişi müharibədən qayıtdıqdan sonra kənddəki kolxozda anbardar işləyib, ehtiyacı olanlara əl tutub, sonralar dərzilik edib, gözəl kostyumlar tikirmiş, həm də təmənnasız. Dövrünün ziyalısı, xeyirxah, hazır-cavab və baməzə adamı kimi yadda qalıb. Ədilin babası İmamqulu kişi isə Şeyx olub. Onun qapısına nicata gələnlərə öz faydalı məsləhətlərini verərmiş. Sovet dönəmində Azərbaycanda, xüsusi ilə keçən əsrin 50-70-ci illərində Zəngilandan dövlət qurumlarında rəhbər vəzifələrdə çalışanların əksəriyyəti Gilətağ kəndindəndir. Onların da çoxu məşhur elm xadimləridir. SSRİ Tibb Elmləri Akademiyasının müxbir uzvü olmuş, tibb elmləri doktoru Nurəli Bünyadov, Azərbaycan SSR Daxili İşlər Nazirinin birinci müavini işləmiş general-mayor Teymur Bünyadov, Azərbaycan KP MK -nın şöbə müdiri işləmiş, tarix elmləri doktoru Bəşir Bünyadov, Azərbaycan KP MK-da şöbə müdiri işləmiş, tarix elmleri doktoru Əsəd Əsədov Azərbaycan SSR Ali Sovetinin bir neçə çağırış deputatı olmuş, Azərbaycan KP səhiyyə şöbəsinin müdiri işləmiş Tamara Bünyadova Qüdrət Muradovun həyat yoldaşı, həm də təəssübkeş bir xanım olmuşdur. Tarix elmlər doktoru, professor Mikayıl Xudayar oğlu Heydərov təkcə Gilətağa deyil, ümumiyyətlə Zəngilandan ilk elmlər doktoru adını qazanmış (1971-ci il) alimlərimizdəndir. Texnika elmləri namizədi uzun illər partiya -sovet orqanlarında rəhbər vəzifələrdə çalışmış Bilal Kərimov, tibb elmləri doktoru Ramiz Bünyadov, Müstəqilliymizin bərpasından sonra Milli Məclisin üzvü olmuş, tibb elmləri doktoru Eldar Abbasov, tibb elmləri namizədi Paşa Mehdiyev, Sehranə xanımın qardaşı Vəliyəddin

Quliyev, Sehranə xanımın böyük qardaşı Xeybər müəllimin oğlu Mürşüd Gülməmmədov hər ikisi fizika -riyaziyyat elmləri namizədidir. Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin 24 may 1960-cı il tarixli fərmanı ilə «Azərbaycan SSR Əməkdar müəllimi»fəxri adına layiq görülən Şamama İman qızı Zamanova təkcə Gilətağda yox, Zəngilanda bu ada layiq görülən ilk xanımlarımızdandır. Ədilin böyük qardaşı Nəriman Quliyevin oğlu istedadlı jurnalist Mikayıl Nərimanoğlu da Zəngulandan az sayda «əməkdar jurnalist fəxri adını alanlardan biridir. Qırx ilə yaxın səhnə fəaliyyəti (Zəngilandandakı çıxışlarını nəzərə almıram) dünyanın bir sıra ölkələrində: Almaniya, İtaliya, Fransa, Şotlandiya, Norveç, İran, Türkiyə, Türkmənistanda Azərbaycan musiqisini, muğamları, xalq və bəstəkar mahnılarını yüksək ustalıqla ifa edən bir neçə beynəlxalq müsabiqənin qalibi, Ədil bəylə Sehranə xanımın ikinci qızı Almaz Orucova vokalistlər arasında Azərbaycan «Respublikasının Əməkdar artisti» fəxri adını alan ilk və yeganə Zəngilanlıdır. Torpaqlarımızın işğalına ürəyi tab gətirməyən mərhum vətənpərvər, nəğməkar şairimiz Hafiz Baxış da Gilətağ kəndinin yetişdirməsidir. Bu, bitməmiş siyahını daha da uzatmaq olar. Azərbaycanda dövlət strukturlarında, ictimai-siyasi sahələrdə Zəngilanlılar olub və var. Bu baxımdan Gilətağlılar da xüsusi yer tuturlar, bu sahə dinamik inkişafdadır. Mən yazımın əvvəlində bildirdiyim kimi çox səmimi və mehriban insanlar olan Zəngilan şəhərində böyük hörmət qazanmış sadə, həlim xasiyyətli Ədil Quliyevdən, onun vəfalı ömür-gün yoldaşı Sehranə xanımdan söhbət açmaq istəyirəm. Ədil Oruc oğlu Quliyev on bir yaşında atasını itirmiş, böyük qardaşı və kiçik bacısı ilə həm müharibənin, həm də, yetimçiliyin məşəqqətli illərini yaşamışdır. Gilətağdakı məktəbdə təhsil almaqla yanaşı, kolxozda işləyən anası Yazgülü xanımın da ev və təsərrüfat işlərində ona yaxın köməkçi olub, bütün çətinliklərə baxmayaraq orta təhsilini yüksək qiymətlərlə başa vurub. Qeyri-adi yaddaşı, qibtəediləcək hafizəsi ona dəqiq elmləri qavramaqda xeyli kömək edib. Təəssüf ki, imkansızlıq ucbatın-

dan ali təhsil ala bilməyib. Ədil Quliyev hərbi xidmətini üç il Ukraynanin Poltava vilayətində keçirib. Dəfələrlə atası Orucun Ukraynanın Zaporejye vilayətinin İvanovka kəndindəki məzarını ziyarət edib. Ədilin nümunəvi xidməti barədə Zəngilan Rayon Hərbi Komissarlığına təşəkkür məktubları gəlib. Hərbi xidməti uğurla başa vurduqdan sonra Zəngilana qayıdan Ədil Ağdamda avtomobil sürücülüyü məktəbini bitirib. 1959-cu ildə Ədilin həyatında ən əlamətdar illərdən biri olub. O,Sehranə Ağabala qızı ilə ailə həyatı qurub və Zəngilan qəsəbəsinə köçüb. Ədil Rayon İstehlak Cəmiyyətində, İpək İdarəsində, Mühafizə bölməsində (Əziz Paşayevlə) Zəngilan Rayon İstehsalat İdarəsində (Vahid İsmayılovla) Kalinin adına Sovxozlar Birliyində (İsmayıl Novruzovla) sürücü işləmiş, tabe olduğu təşkilat rəhbərlərinin hörmət və etibarını qazanmışdır. Mən onu bəlkə də ilk iş yeri olan Rayon İstehlak Cəmiyyətindən tanıyırdım. RİC-nın Ərzaq anbarı məhəlləmizdəki istifadəsi qadağan olunmuş köhnə. məsciddə yerləşirdi. Mərkəzdən gələn ərzaqları ora boşaldılır, oradan da qəsəbədəki və kəndlərdəki mağazalara paylanırdı. Zəngilanda hamının tanıdığı Rüstəmov Müzəffər orada anbardar işləyirdi. Ədilin idarə etdiyi «Qaz 51»-ə yük vurulanda və ya boşaldılanda o, sakitcə durar, fəhlələri tələsdirməz, bəzən özü də, onlara köməklik edərdi. Ədilin simasında bir nur var idi, danışığı da davranışığı da ona peyğəmbər görkəmi verirdi. Vaxtilə bu bina Allah evi kimi fəaliyyət göstərmiş, qonşumuz və yaxın qohumumuz Xəlil Quliyevin atasi İbiş orada mollalıq etmişdi. Ədilin xeyirxah və mədəni davranışını mən məscidə-Allah evinə sitayiş kimi qiymətləndirirəm. Sonralar mənə məlum oldu ki, illər keçdikcə Ədil «Qurani -Kərim»i oxuyub bir sıra surələri də əzbər bilirmiş. Onun yatımlı səsi, «Zabul seygah» muğamını da xüsusi şövqlə oxumağı, hətta hərdən şeir yazmağı da varmış. Ədilin yazdığı bir neçə qəzəli də olub, utancaqlıqdan üzə çıxartmayıb. Ədil Zəngilan qəsəbəsinə köçəndə onun 27 yaşı (1932-ci il təvəllüddür) Sehranə xanımın isə 19 yaşı (1940-cı il təvəllüddür) vardı. Onlar az müddətdən sonra Lenin

küçəsinin qurtaracağında, məşhur «Dağüstü parkın» ətəyində münbit bir sahədə yaraşıqlı ev tikdirmiş, həmin evdə üç qız, iki oğlan övladı böyüdüb, tərbiyə etmişdilər. Mən Sehranə xanımı keçən əsrin 60-cı illərindən tanıyırdım. Ədilin həm daxili, həm də simasındakı gözəllikdən Allah-Təala ona da vermişdi. Dilli-ağızlı, salamlı-kəlamlı, xoşxasiyyət bir xanım idi, o zaman Zəngilan rayon Mədəniyyət Şöbəsində işləyirdi. Həmin dövrdə Mədəniyyət Şöbəsində və Kino birliyində bir neçə istedadlı gənc çalışırdı. Çörəkçi Mürsəl kişinin qızı Fatma Hüseynova məşhur muğam və mahnı ifaçısı Həcər Hüseynova, Əliyev Ənvər Alyar oğlunun həyat yoldaşı Səmayə Bədəlova, Sehranə Quliyeva muğam və xalq mahnılarının bənzərsiz ifalarına görə geniş tamaşaçı kütləsinin böyük rəğbətini qazanmışdılar. Fəsi Məmmədovla Fatma Hüseynova çox vaxt Ü.Hacıbəylinin «Arşın mal alan» musiqili komediyasından Telli ilə Vəlinin rəqsini və duetini ifa edirdilər, özü də personajların geyimində. Fəsinin əl barmaqları ilə çırtığı o qəder güclü idi ki, salonun lap axırıncı cərgəsində əyləşən tamaşaçılar da həmin səsi eşidirdilər. Bu rolları bəzən Mincivan qəsəbə dəmir yolu klubunun müdiri işləyən əslən Ordubadlı olan Löhraz və Həcər Hüseynova da aparırdı. 25 ildən çox Zəngilan rayon Mədəniyyət şöbəsinə rəhbərlik etmiş Camal Sultanov o zaman 60-cı ilin ortalarında Mədəniyyət evinin müdiri işləyirdi. Gilətağ kəndindən Gülüs adlı traktorçu da konsertlərə cəlb edilmişdi. Onun şüşə təki şəffaf, zil və güclü səsi vardı.«Heyratı» zərb muğamını onun tək ifa edən yox idi. Səsi Yaqub Məmmədovun, Mürşüd Məmmədovu səsinə bənzəyirdi. Həmin dövrlərdə mikrofonla ifa yox idi. Bakıdan gələnlər də, yerli ifaçılar da öz təbii səsləri ilə.oxuyurdular, bu da tamaşaçılara böyük zövq verirdi. Sehranə xanımı ancaq muğam, mahnı və təsnif ifaçısı kimi görmüşdüm. Yuxarıda adlarını çəkdiyim xanımların respublika radiosunun Qızıl fondunda lent yazıları vardı. «Kəsmə şikəstə», «Qarabağ şikəstəsi», «Bəh -bəhbəh» adlanan zabul təsnifi və s. Əvvəlki yazılarımda da qeyd etmişəm ki, kino və konsertlərə, bədii özfəaliyyətə maraq çox böyük

idi. Başda Tofiq Hacıyev olmaqla Yadulla Hacıyev, Abbas Hüseynov, Əsgər Əsgərov, Ənvər Həsənov, Məhərrəm Quliyev (Mahi), Ərşad Əzimzadə, Zülfüqar Məmmədov, Şahmar Bayramov, Cabbar İmanverdiyev, Qıraq Müşlan kəndindən feldşer Fehruz, Tofiq muəllimin xalası oğlu İbiş, Yadulla  müəllimin qardaşı, Zakiri kiçik klubun səhnəsində görmüşəm. Şahmar gözəl səsə malik idi, həmişə Əbülfət Əliyevin repertuarından təsniflər oxuyardı. İbiş.də muğam ifa edərdi. Zakir tarda solo çalardı. O biri ziyalılar isə M.F.Axundzadənin, N.B.Vəzirovun, C.Məmmmədquluzadənin, Ü.Hacıbəylinin, C.Cabbarlının əsərlərindən müəyyən səhnələri göstərərdilər. Bir qayda olaraq Tofiq Hacıyev həmişə baş rolların ifaçısı olardı Zəngilanda televiziya yayımı olmadığından adlarını çəkdiyim şəxsiyyətlərin bu sahədəki xidmətləri həm də maarifləndirici xarakter daşıyır və anlaşıqlı olurdu.  Sehranə xanımın qardaş və bacılarının muğam ifaçılığı Allah vergisi idi. Onun özündən böyük qardaşı Xeybər müəllim, bacıları Simuzər və Səkinə xanımın, digər qardaşları Aydın və Vəliyəddinin bu sahədə xüsusi istedadları olmuşdur. Simuzər xanım 1945-ci ildə keçirilən festivalda birinci dərəcəli diploma layiq görülmüş, onu Opera və Balet Teatrına dəvət etsələr də atası buna razılıq verməmişdi. 1952-ci ildə festival qalibi olan (Çahargah təsnifinin mükəmməl ifasına görə) 21yaşlı Xeybər müəllimi Bakıya dəvət etsələr də gənc müəllim rayonda öz peşəsində işləməyə üstünlük verir, çünki, Zəngilanda o zaman ali təhsilli müəllimlər olduqca az idi. 1956-cı ildə Sehranə xanım da festival qalibi olub, lakin 16 yaşlı gəncin əmiləri onun bu işi davam etdirməsinə razılıq verməyiblər. Tibbi təhsil aldıqdan sonra Sehranə xanım əvvəlki işindən vidalaşıb Zəngilan rayon SES-də lobarant vəzifələrində (tibb bacısı) çalışıb.

Şəcərənin bu sahədəki istedadının biruzə verilməsi və inkişaf etdirilməsi milyonlarla azərbaycanlıya çatdırılması əməkdar artist Almaz Orucovanın üzərinə düşüb. O, qırx  ilə yaxındır ki, bu missiyanı şərəflə, ləyaqətlə yerinə yetirir.   Bu ailə ilə yaxınlığımın səbəbkarı ailənin böyük qızı 1960 -cı il təvəllüdlü Nigar

xanım olmuşdu. 1976-1979-cu illərdə o, mənimlə Zəngilan Rayon Pioner və məktəblilər evində bir yerdə işləmişdi. Nigar olduqca sakit, utancaq, işinin öhdəsindən layiqincə gələn bir gənc idi. İşləyə-işləyə ali məktəbə qəbul olundu və yüksək qiymətlərlə oranı bitirdi.1979-cu ildə 19 yaşlı Nigar Zəngilan şəhər 1 saylı orta məktəbində komsomol komitəsinin katibi seçildi. 1981-ci ilin avqust ayının 15-də Nigar xanımın toyu oldu. Məni də ən yaxın adam kimi dəvət etmişdilər. Zəngilanda böyük hörmət sahibi, Vənətli kənd sakini, el ağsaqqalı Kərim Kərimovun oğlu Ramizlə ailə həyatı quran Nigar xanımgil Bakı şəhərinə köçdülər. İxtisasca inşaatçı olan Ramiz burada tikinti təşkilatlarından birinə rəhbərlik edirdi. Olduqca mərifətli bir şəxs idi. Bu cütlük ən nümunəvi bir ailənin rəmzi sayılırdı. Təssuf ki 2016-cı ildə Ramiz vaxtsız olaraq əbədiyyətə qovuşdu. Qəbri nurla dolsun. «Can deyib can eşidən» Ədil Quliyevlə Sehranə xanımın (1959-2001-ci illər) 42 illik ailəçilikləri dövründə 5 övladı olmuşdur. Nigar xanımdan sonra 1962-ci ildə Kazım, 1964-cü ildə Eyvaz, 1966-cı ildə Almaz, 1973-cü ildə Sevda dünyaya gəlmişdir. Kazım gəmiçilik məktəbini bitirmişdi. 2010-cu ildə rəhmətə gedib Allah rəhmət eləsin! Eyvaz atasının yolu ilə gedərək sürücülük ixtisasına yiyələnib. O, birinci Qarabağ müharibəsi iştirakçısı, veteranı və Prezident təqaüdçüsüdür. Ailənin son beşiyi Sevda xanım ixtisasca iqtisadçıdır. İxtisası üzrə Neft Şirkətində işləyir. Ailənin ilki Nigar xanım 43 ildir ki, pedaqoji sahədə çalışır. İşlədiyi məktəbdə böyük nüfuz sahibidir. Ədil Quliyevlə Sehranə xanımın 7 nəvəsi var. Hamısı baba və nənələrinin arzuladiğı ali təhsil alıb. Nigar xanımın hər iki övladı ali təhsillidir. Hətta qızı 2 ali məktəb bitirib. Kazımın hər iki qızı ali təhsillidir. Eyvazın iki oğlundan biri Türkiyədə ali məktəbin jurnalistika fakultəsində təhsil alır. Digər oğlu Rabitə kollecində oxuyur. Almaz xanımın oğlu İtaliyada ali təhsil alır, italyan və ingilis dilində sərbəst danışır. Nigar xanım oğlum Vüqarla, hərdən görüntü ilə mənimlə mütamadi əlaqə saxlayır, halımı soruşur, səhhətimlə maraqlanır, mənə xoş. günlər

arzulayır. Bax, budur etibarlılıq budur gözəl tərbiyə, o bununla özü də hörmət qazanır. Yaşlı adamlar üçün bundan yaxşı nə ola bilər? Yazımı yekunlaşdırarkən. Ədil Quliyevə və Sehranə xanıma rəhmət diləyirəm! Oxucuların ovqatını təzələmək, pozitivləşdirmək üçün Sehranə xanımın atası Ağabala kişinin bir lətifəsini dərc edirəm:

Gilətağ kəndinin ən hörmətli və hazırcavab adamlarından biri olan Ağababa kişiyə məsləhət üçün, ehtiyac üçün ağız açanlar çox olurmuş, o da gələnlərin diləyini, ehtiyacını imkanı daxilində yerinə yetirərmiş. Bir gün kəndin yaşlı adamlarından sayılan Minə nənə Ağabala dayının yanına gəlib ki, Ağabala qağa mənə bir məsləhət ver, gözüm ağrıyır neyniyim ? Ağabala kişi deyir ki, ay rəhmətliyin qızı göz neynəsin? 70 ildir bir deşikdən baxır, ağrımasın neynəsin? **Asif Bağırov 21 dekabr 2022-ci il .**

**Quliyev Şəhriyar Paşa oğlu**

*Zəngilanlı şahmat bilicisi*



Quliyev Şəhriyar Paşa oğlu 1924-cü ildə Zəngilan rayonunun Məlikli kəndində anadan olub. Orta təhsilini Zəngilan kənd məktəbində bitirən Şəhriyar elə həmin məktbdə də müəllim kimi əmək fəaliyyətinə başlayır. 1941-1945-ci illərdə Sovet Ordusunda xidmətdə olub. 1946- cı ildə Azərbaycan Dövlət Universitetinin yeni açılmış Fəlsəfə fakültəsinə daxil olur. Ailə vəziiyyəti ilə əlaqədar təhsili yarımçıq qoyub, Ədliyyə Nazirliyi nəzdində xüsusi hüquq məktəbinə daxil olub. 1950-ci ildə hüqüqçü ixtisası üzrə həmin məktəbi fərqlənmə diplomu ilə bitirib. 1950-1953-cü illərdə Ədliyyə nazirliyi nəzdində Zəngilan rayon Notariusu vəzifəsinə təyinat alıb. Sonra 1964-1967-ci illərdə Cəbrayıl, 1967-1970–ci illərdə

isə Zəngilan rayon «Məhsul Kənd Könüllü İdman Cəmiyyəti» nin sədri işləyib. Şəhriyar Quliyev 1973-1976-cı illərdə ASE-nin hüquq redaksiyasında böyük elmi redaktor olub. Sonralar o 1946-cı ildə daxil olduğu Universiteti 27 ildən sonra 1976- cı ildə bitirir. O Cəbrayılda şahmat məktəbi yaratmışdır. Indi həmin məktəb onun adını daşıyır. Quliyev Şəhriyar Paşa oğlu tələbələr arasında şahmat üzrə Azərbaycan çempionu olmuşdur. 1951-ci ildə Seyid Mirmahmudun qızı Qumru ilə evlənmiş və ondan üç övladı olmuşdur. Həyat yoldaşı küçədə baş verən qəza səbəbindən dünyasını dəyişmişdir. Bundan çox kədərlənən Şəhriyar Quliyev 38 yaşı olmasına baxmayaraq bir daha evlənməmişdir. Quliyev Şəhriyar 04 fevral 1992-ci ildə Cəbrayıl qəsəbəsində vəfat etmişdir. Onun üç övladı, 9 nəvəsi və 16 nəticəsi var. Əsərləri barədə

1. Şahmat tariximizdən səhifələr Az. Döv. Nəş. Bakı. 1966. 112 s
2. İliç şahmatı sevirdi. Bakı. Gənclik. 1970, 60 səhifə
3. Nərd oyunu Bakı . Gənclik 1985. 145 səhifə
4. Cəbrayıl. Bakı, İşıq nəşriyyatı. 1993, 106 səhifə
5. Azərbaycan xalqının mədəni məişətində şahmatın tarixi oçerkləri (VI-XX əsr) monoqrafiyası. Quliyev Şəhriyar Paşa oğlu bunlardan əlavə yüzlərlə elmi və publisistik məqalənin müəllifidir.

**Mehrəliyev Nəcəf Hüseyn oğlu**

*müəllim*



Mehrəliyev Nəcəf Hüseyn oğlu 1949-cu ildə Zəngilan rayonunun Bürünlü kəndində anadan olub. 1956-cı ildə Pirçivan kənd orta məktəbinin I sinfinə getmiş, 1966-cı ildə Zəngilan qəsəbə orta məktəbini bitirmişdir. Orta məktəbi bitirdikdən sonra elə həmin il Azərbaycan Dövlət Pedaqoji İnstitutunun riyaziyyat fakültəsinə daxil olub. Ali təhsilini 1970-

ci ildə başa vuran Mehrəliyev Nəcəf Hüseyn oğlu 1970-1973-cü illərdə Sovet Ordusu sıralarında Leninqrad vilayətində həqiqi hərbi xidmətdə olub Hərbi xidmətdən tərxis olunandan sonra 1973-cü ildən rayonun işğalına kimi 1 saylı Zəngilan şəhər orta məktəbində riyaziyyat fənindən dərs deyib. Mehrəliyev Nəcəf Hüseyn oğlu 1975-ci ildə ailə həyatı qurub. Onların 4 övladı, 10 nəvəsi var. Mehrəliyev Nəcəf Hüseyn oğlu 11 may 2020 -ci ildə dünyasını dəyişmişdir.

-oğlu Hüseyn 1976-cı ildə Zəngilan şəhərində anadan olub. Təfəkkür Universitetini bitirib, iki oğlu, iki qızı var.

-qızı Flora 23 fevral 1978-ci ildə Zəngilan şəhərində anadan olub. Kooperativ Texnikumunun Əmtəəşünaslıq fakültəsini bitirib. Evlidir 2 övladı var.

-qızı Ellada 01 yanvar 1980-cı ildə Zəngilan şəhərində anadan olub. Kooperativ Texnikumunun Hüquqşünalıq fakültəsini bitirib. Evlidir 2 övladı var.

-qızı Elnarə 25 fevral 1981-ci ildə Zəngilan şəhərində anadan olub. Orta təhsillidir. Evlidir 2 övladı var.

Nəcəf müəllim sözünü, işini bilən bir ziyalı idi. Allah rəhmət eləsin.

## Mehtiyev Ərşad İbiş oğlu

*Milis işçisi*



Mehtiyev Ərşad İbiş oğlu 1934-cü ildə Pirçivan kəndində anadan olub. İlk təhsilini Pirçivan kənd məktəbində alıb. Sovet Ordusunda hərbi xidmətdən sonra Bakı Neft Texnikumunu bitirib. Bu arada iki il Sumqayıt şəhərində Aliminium zavaodunda işləyib. Sonra doğma kəndinə dönən Mehtiyev Ərşad İbiş oğlu 1960-cı ildə milis sisteminə işə qəbul olunub. O burada işlədiyi 30 il ərzində özünü əsil milis kimi aparmış, xalqının xidmətində namusla çalışmışdır.

Ərşad dayı 70- ci illərdə Mincivan qəsəbəsində sahə müvəkkili də işləyib. Bu sistemdə işlədiyi illər ərzində rəislərdən Fərhad Əliyev, Əsəd Məmmədov, Vasif Əhmədov, Möhübbət Əliyev, İsfəndiyar Gözəlov, Nəriman İsayevlə birgə işləmiş, hamısının da ona dərin hörməti olmuşdur. O illərdə Ərşad dayı ilə bərəbər bir neçə nəfər də milisə işə qəbul olunsalarda bəziləri müəyyən səbəblər üzündən sistemdən uzaqlaşmışlar.

Mehtiyev Ərşad İbiş oğlu 1990-cı ildə milis sistemindən təqaüdə çıxşımşdır. Rayonun işğalından sonra Sumqayıt şəhərində məskunlaşmışdır. O elə bu şəhərdə də 2016- cı ildə dünyasın dəyişmişdir. Onun İbiş adlı bir oğlu, Gülnarə və Rübabə adlı iki qızı var. Mehtiyev Ərşad İbiş oğlunun iki nəvəsi, biri adlısı Mehtiyev Ərşad İbiş oğlu, digəri isə Mehtiyev Rəşad İbiş oğlu onun yolu ilə gedərək Daxili İşlər Orqanlarında xidmət edirlər. Hər ikisi zabitdir.

Asif Bağırov Mehtiyev Ərşad İbiş oğlu barədə çox xoş sözlər dedi. Ərşad milis nəfəri olsada ona zabitlik daha yaxşı yaraşardı. Əsil sistem adamına bənzəyirdi. Həmişə səliqəli-sahmanlı geyinər, üst başına fikir verərdi. Yəni əsil xalq milisi idi.

O bildirir ki, Ərşad da bir milis kimi həmişə xalqın tərəfində dayanmış, milisləri qanun pozanlardan eyni zamanda da bəzən səhvi üzündən qanunu pozanları da milisdən qorumuşdur. Adamı ilişdirməyə nə var ki, kişi odur ki yamanlığa yaxşılıq eləyə.

## Məcidov Yavər Məhəmmədəli oğlu

*Milli Ordunun Pölkovniki*



Məcidov Yavər Məhəmmədəli oğlu 1951-ci ildə Zəngilan rayonunun Ağbis kəndində, qulluqçu ailəsində anadan olmuşdur. 1969-cu ildə Bakı şəhərində orta məktəbi qurtarmış və elə həmin il ADU nun fizika fakültəsinə qəbul olunmuşdur. 1973-74-cü illərdə təhsilini Leninqrad şəhərində davam etdirmiş, Ali təhsil

almışdır.Universiteti bitirdikdən sonra 1975-77-ci illərdə Bakı elektron hesablama maşınları zavodunda əvvəlcə usta, baş usta və sahə rəisi vəzifələrində çalışıb. 1977-80-ci illərdə Zəngilan rayon kolxozlar arası tikinti idarəsində mühəndis, 1980-1982-ci illərdə komunal muəssisələri kombinatında baş mühəndis, 1980-90 cı illərdə isə həmin kombinatın rəisi olmuşdur. Sonra Yavər Məcidov sovet işinə keçmiş, 1990-92-ci illərdə Zəngilan şəhər Xalq Deputatları Soveti İcraiyyə Komitəsinuin sədri işləyib. 1992-ci ildən Azərbaycan Respublikasının ərazi bütövlüyünün qorunmasında iştirak etmək üçün, Azərbaycan Respublikası Silahlı qüvvələrində hərbi xidmətə başlayaraq, Zəngilan rayonunda dislokasiya olmuş hərbi hissədə, hərbi hissə komandirinin şəxsi heyətlə iş üzrə müavini vəzifəsində xidmət göstərmişdir. Sonralar xidmətini Goronboy, Murov istiqamətində aparılan döyüşlərdə iştirak edən hərbi hissədə davam etdirmişdir. 1991-94-cü illərdə Bakı şəhərində yerləşən hərbi hissədə komandirin müavini, 1995- cı ildən Müdaifə Nazirliyinin tərbiyəvi işlər idarəsində hərbi qulluqçuların sosial hüquq müdafiəsi və hərbi intizamın təhlili şöbəsində, 1999 cu ilədək şöbə rəsinin müavini, 1999 cu ilin may ayından isə həmin şöbənin rəisi vəzifəsində xidmətini davam etdirmişdir.

Yavər Məcidova 2003-cü ildə polkovnik rütbəsi verilmişdir. 2004-cü ildə ordudan tərxis olunandan sonra, Respublika Hərbi Komissarlığında şöbə rəisinin köməkçisi, 2005-ci ilin iyunundan Müdafiə Nazirliyi hərbi Elmi tədqiqat idarəsinədə elmi işçi olub. 2009-cu ildə idarədə struktur dəyişiklikləri ilə əlaqədar olaraq həmin idarənin bazasında təhsil, tədris və elmi-tədqiqat idarəsi yaradılır. O, mülki olaraq burada işini davam etdirir. Məcidov Yavər Məhəmmədəli oğlu 2021- ci ildə vəfat etmişdir.

**Məhərrəmov Əli Xanış oğlu.**

*Azərbaycan Respublikası Memarlar İttifaqının üzvü*



Məhərrəmov Əli Xanış oğlu 1954-cü il aprel ayının 16 -da Gəncə şəhərində anadan olmuşdur. Sonra Mincivana köçmüşlər. 1961-1971-ci illərdə Mincivan qəsəbəsindəki dəmiryolu orta məktəbində oxumuşdur. Orta məktəbi bitirəndən sonra 1971-ci ildə o vaxtkı Ç.İldırım adına Azərbaycan Politexnik İnstitutuna daxil olmuşdur. Ali məktəbi müvəffəqiyətlə bitirən Əli memar ixisasına yiyələnmiş, müxtəlif təşkilatlarda çalışmışdır. Onun demək olar ki, ixtisası üzrə işlədiyi son iş yeri Zəngilan rayon XDS İK oldu.

Əli sözün həqiqi mənasında memar idi. Mən həyatımda onun qədər istedadlı, öz işini bilən və işə canı dildən yanaşan təmiz, saf, heç kəsin əlinə baxmadan öz işini namusla, vicdanla görən birinə rast gəlmədim. Çox təəssüflər olsun ki, Əlinin işinə heç bir vaxt qiymət verilmədi. Bu sahə ilə az-çox tanış olanlar bilirlər ki, sovet zamanında mərkəzə göndərilən bütün sənədlər, layihələr və s texniki sənədlər rus dilində aparılırdı. Bu işi Əlidən başqa birisi hazırlaya bilməzdi. Əli rayon üçün çox qiymətli bir kadr idi.

Yaxşı yadımdadır, 80-ci illərdə Zəngilan rayonunun memarı Dilşad Həsənova başqa işə keçməsi ilə əlaqədar olaraq işdən getmişdi. Hamı düşünürdü ki, bu vəzifəyə Əlidən başqa bir namizəd ola bilməz. Çox təəssüflər olsun ki, Əli kimi bir kadr burada ola-ola kənardan birini gətirib bu vəzifəyə təyin elədilər. Ən acınacaqlısı da o idi ki, o adam memar deyldi. Görəsən nə vaxtsa, biz özümüz-özümüzə qiymərt verəcəyikmi?. Onu da deyim ki, bu hamımızın xeyrinə olar. Belə olanda əlinin anası oğlunun hüquqlarını qorumaq üçün yuxarı təşkilatlara ərizə ilə müraciət etmişdir.

Ərizə tədbir görülməsi üçün rayona göndərilmişdi. Rayon rəh-

bərliyi tədbir əvəzinə Əlinin bu məsələsini ilk partiya təşkilatında müzakirə etdilər. Çıxış edənlərin əksəriyyəti Əlini haqsız hesab elədi. Hansı ki, Əli heç Kommunist partiyasının üzvü də deyildi.

Bu iclasda mənə söz vermədilər. Mən Əlini orada müdafiə etmədiyimə görə özümü günahkar hesab edirəm.

Burada rəhmətlik Qabilin səhv düşəndə yerimiz şeri yada düşür.

*Ağ biləklər gül əllər, tarlada qabar*
*Bir yekəpər qeyrətsiz, gızılgül satar*
*Qeyrətsiz oluruq biz,*
*Səhv düşəndə yerimiz.*

Məhərrəmov Əli Xanış oğlu 2020-ci ilin dekabrında vəfat edib.

**Məmmədov Həsən Əsəd oğlu**
*II dərəcəli Şöhrət ordenli*





Məmmədov Həsən Əsəd oğlu 1922-ci ildə Zəngilan rayonunun Dardanyuxarı deyilən kəndlərindən olan Şərikanda anadan olmuşdur. O Pirçivan orta məktəbini sonra isə Azərbaycan Dövlət Pedaqoji İnstitutunu bitirmişdir. Həsən müəllim düz 60 il məktəbdə dərs demişdir. Çox təəsüüf ki, onun bu əməyi layiqincə qiymətləndirilməmişdir. Böyük Vətən Müharibəsinin qəhrəmanlarından biri olan Həsən müəllim Berlinə kimi şərəfli bir döyüş yolu keçmişdir. Onun sinəsini III dərəcəli Şöhrət Ordeni bəzəyirdi. Şöhrət Ordeni ilə təltif olunanları Zəngilan rayonunda barmaqla saymaq olar. Bundan başqa Həsən müəllim Qafqazın müdafiəsinə, Varşavanın, Berlinin alınmasına

görə medallarla da təltif olunub. O 383-cü atıcı diviziyada kiçik komandir olmuşdur.

Həsən Məmmədov da həyatının son illərini Bakı şəhərində məcburu köçkün kimi yaşamışdır. Onu da bir çoxları kimi vətən həsrəti çox narahat edirdi. Həsən müəllim 2004-cü ildə Bakı şəhərində vəfat etmişdir. .

**Məmmədov Rza Mikayıl oğlu**

*Ordenli Müharibə (1941-1945) veteranı*



Məmmədov Rza Mikayıl oğlu 1916-cı ildə Zəngəzur qəzasının Mehri elinin Tuğ kəndində anadan olub. 19 yaşı olanda Zəngilanın Şatarız kəndinə gəlib. Rza dayı 1939-cu ildə Bakı şəhərində kinomexanik kursu bitirib və rayona qayıdaraq Kinolaşdırma idarəsində kinomexanik işləyib. O 1937-ci ildə Kinolaşdərma idarəsinin müdiri təyin edilib. Rza Məmmədov 1942-ci ildə 1941-1945-ci illər müharibəsinə göndərilmiş və döyüşlərin birində yaralanmışdır. O yaraları səbəbindən 1944-cü ildə ordudan tərxis olunur və rayona qayıtdıqdan sonra yenə Kinolaşdırma idarəsində öz işinə davam etmişdir. 1965-ci ilə kimi komxozda montyor işləyən Rza dayı 1965-ci ildə Zəngilan şəbəkə rayonu yaradılanda orada baş elektrik montyoru kimi çalışıb və 1970-ci ildən isə həmin idarədə usta işləyib. O bütün həyat boyu ürəyində 2 sm–lik qəlpə gəzdirib.

1976–cı ildə təqaüdə çıxsa da yenə də işləyib. Rza Məmmədov 1980-ci ildə işdən ayrılıb 1990-cı ildə Sovet ordusunun Bakı şəhərində əhalimizə divan tutmasından sonra rayon partiya komitəsinin qarşısında müharibə zaman aldığı partiya biletini atmışdır. Rayon qəzetində ədəbiyyat müəllimi Tofiq Hacıyev onun barəsində bir neçə dəfə yazıb.

Məmmədov Rza Mikayıl oğlu rayonun işğalından sonra

Sumqayıt şəhərində məskunlaşmış və elə bu şəhərdə də 2004-cü ildə vəfat edib. Oğulluğu İzzət Məmmədovun dediyi:

- Atalığım çox xeyirxah insan idi. Evdə həmişə böyük lampası olan kabeli olardı. Kimin xeyir işi olardısa onu aparıb onların çadırına bağlardı. Hüzr yerlərinə də eyni ilə yardım edərdi.

**Məmmədov İzzət Ağabala oğlu**



Məmmədov İzzət Ağabala oğlu 22 may 1937- ci ildə Pirçivan kəndində anadan olub. 1945-ci ildə Pirçivan kənd orta məktəbinin I sinfinə daxil olan İzzət Ağabala oğlu məktəbin 7 sinfini əla qiymətlərlə bitirmiş sonra isə 1952- ci ildə Bakı Neft Texnologiya kollecinin energetika fakültəsnə daxil olmuşdur.

1956- cı ildə texnikumu bitirdikdən sonra Sumqayıt şəhərindəki Boruprokat zavodunda təyinatı verlib. Burada 6 il işlədikdən sonra 1962-ci ilin sentyabrında Zəngilan rayonuna dəyişilib. Elə bu ildən elektrik ustası kimi əmək fəaliyyətini davam etdirib. 1965- ci ilin mayında Azenerji yaradılanda Zəngilan rayon şəbəkə rayonuna rəis müavini təyin olunub. 1969- cu ilin 01 oktyabrında Füzuli elektrik şəbəkəsinə dəyişdirilib. Sonra 1976- cı ilin 01 mayında Zəngilan şəbəkə rayonuna rəis təyin edilib. 1981- ci ildə bu vəzifədən azad olunandan sonra 100 kilovoltluq **elekrtoviliz** (bu sözü dəqiqləşdirmək) xəttində usta işləyib. O, 8 fevral 1983- cü ildə Respublika kənd Təsərrüfatı Nazirliyində Zəngillan kənd təsərrüfatı enerji müəssissəsinə sədr təyin olunub. 1990- cı ilin noyabrında isə Qubadlı şəbəkə rayonunun Zəngilan şəbəkə rayonu üzrə rəis təyin olunub. 1993 –cü ilin mayında Zəngilan elektrik şəbəkəsinə baş mühəndis vəzifəsinə keçirilib. 29 sentyabr 2002- ci ildə elektrik şəbəkə rayonu ləğv olunandan somra 02 yanvar 2003 –cü ildə Abşeron elektrik şəbəkəsində Xətai rayonu üzrə mühəndis keçirilib. 2005-ci ilin 03 yanvarında isə 110 kilovoltluq Əhmədli yarımstansiya-

sında usta işləyib. 08 yanvar 2009- cu ildə işdən çıxıb.

İzzət Məmmədov rayonda keçirilən mədəni kütləvi- idman tədbirlərində fəal iştirak edib. O 1955- ci ildə dərəcəsiz şahmatçılar arasında Azərbaycan çempionu olmuşdur. Məmmədov İzzət Ağabala oğlu 1971- ci ildə Zəngilan şəhər XDS-nin deputatı seçilb. Rayonda keçirilən futbol və şahmat turnirlərinə hakimlik etmişdir.

**Ailəsi barədə.** Yoldaşı Məmmədova Fizzə Firudin qızıdı.

-qızı Rəbiyə. İki oğlu var.

-oğlu Məhiyəddin-6 aylıq olarkən vəfat edib

-oğlu Arzu. Ali təhsili olub. ABŞ-da Kaliforniyada yaşayırdı. Ürək xəstəliyindən vəfat edib. Bir oğlu bir qızı var

-qızı Sahibə. Ali təhsilli Rus dili müəlimidir. Iki qızı var. Hər ikisi Azərbaycan Tibb İnstitutunu bitirib

-qızı Dilşad. Xarici Dillər İnstitutunu bitirib. Bir oğlu bir qızı var

-oğlu Firdövsi. Orta təhsillidir prezident təqaüdçüsüdür. Bir oğlu bir qızı var

-qızı Gülbikə. Mühasibat texnikumunu bitirib. İki oğlu bir qızı var

-qızı Kəmalə. Tibb Texnikumunu bitirib. Iki oğlu bir qızı var.

## Mustafayev Mustafa Əliabbas oğlu

*1941-1945- ci illər müharibəsi iştirakçılarından*



Mustafayev Mustafa Əliabbas oğlu 1916-cı ildə Zəngəzur qəzasının Ağkənd kəndində anadan olub. İlk təhsilini harada alması barədə bir məlumat yoxdur. Sonra Bakı şəhərində Maliyyə kredit Texnikumunu bitirib. Texnikumu bitirdikdən sonraq rayona gələn Mustafa Mustafayev müxtəlif təşkilatlarda işləmişdır. 1940- cı ilin dekabrında Gülxanım Cabbar qızı

ilə evlənmişdir. Sonra 1941-1945-ci illər müharibəsi başlayanda səfərbərliyə alınaraq cəbhəyə göndərilmişdir. Döyüşlərin birində yaralanmış müalicə olunduqdan sonra yenidən cəbhəyə dönmüşdür. Müharibənin sonuna kimi azğın düşmənə qarşı vuruşan M. Mustafayev baş leytenant rütbəsində ordudan tərxis olunmuşdur. Müharibədən sonrakı illərdə onun əsas fəaliyyəti Zəngilan rayon bangı ilə bağlı olub. O bu idarənin formaslaşmasında xeyli əmək sərf etmişdir. M.Mustafayev 30 ildən çox rayon Dövlət bangına rəbərlik etmişdir.

Mustafayev Mustafa Əliabbas oğlu 1978-ci ilin 17 iyununda Zəngilan şəhərində vəfat etmişdir.

**Mustafayev Vəli Mustafa oğlu**

*Rayon qəzetinin redaktorlarından*

*II dərəcəli Şöhrət Ordenli*





Vəli Mustafa oğlu Mustafayev 1921-ci ildə rayonun Yuxarı Yeməzli kəndində anadan olub.

Bir çoxları kimi o da ilk təhsilini kənd məktəbində almış, amma amansız müharibə ona təhsilini davam etdirməyə imkan verməmişdir. O, Tula, Pskov, Narva ətrafına gedən ağır döyüşlərdə iştirak etmiş, sonra Kiyevin, Riqanın, Orlovun, Volxovun azad olunmasında fərqlənmişdir.

Cəbhədəki fəaliyyətinə görə ona III dərəcəli «Şöhrət Ordeni» verilsədə, onu ala bilməmişdir. Onun bu mükafatını, 1970-ci ildə özünə təqdim elədilər. Müharibədən sonra Vəli Mustafayev uzun müddət partiya, sovet orqanlarında məsul vəzifələrdə çalışmış, 1956-1961-ci illərdə Rayon qəzetinin redaktoru işləmişdir. Sonrakı illərdə o Sosial təminat şöbəsinin müdiri işləyib. Vəli Musta-

fayevin əsas xüsusiyyətlərindən biri sözü üzə şax deməsi kimsədən çəkinməməsi idi. Rayonumuzda saflığı, təmizliyi ilə sayılıb seçilən kişilərdən biri idi.

Mustafayev Vəli Mustafa oğlu 1992-ci ildə vəfat etmiş və Zəngilan şəhərində dəfn olunmuşdur.

**Mübariz Əlixanoğlu**

*Respublikanın əməkdar artisti*



**Paşayev Mübariz Əlixan oğlu (Mübariz Əlixanoğlu)** - Azərbaycan aktyoru, Azərbaycanın əməkdar artisti.

Mübariz Əlixanoğlu 1972-ci ildən 2006-cı ilə kimi Azərbaycan Dövlət Gənc Tamaşaçılar Teatrında çalışmışdır. Xüsusi səs tembrinə malik idi. 20-ə qədər filmdə və «Mozalan» süjetlərində əsasən epizodik rollarda çəkilmişdir. 2007-ci ildə vəfat etmişdir. Azərbaycanın əməkdar artist fəxri adına layiq görülüb.

1. 777 №-li iş (film, 1992) (tammetrajlı bədii film)
2. Absurdistan (film, 2008) (tammetrajlı bədii film) - saatsaz
3. Boş yer (film, 1989)
4. Dantenin yubileyi (film, 1978)
5. Gecə qatarında qətl (film, 1990)
6. Hərənin öz payı+tayı (film, 2006)-Əbülhəsən
7. Qərib cinlər diyarında (film, 1977)
8. Qəribə adamlar (film, 1978)
9. Məhəbbətin hökmü (film, 1998)
10. Musiqili sınaq (film, 1982)
11. Od içində (film, 1978)
12. Özgə ömür (film, 1987)-Dadaşov
13. Şeytan göz qabağında (film, 1987)
14. Şir evdən getdi (film, 1977)

15. Yaramaz (film, 1988)
16. Bahar əyləncələri (film, 1989)
17. Yol əhvalatı (film, 1980)
18. Yumurta (film, 2003)

**Mübariz Əlixanoğlu — Vikipediya (wikipedia.org)**

**Paşayev Seyfəddin Teymur oğlu**

*Əhaliyə Məişət Xidməti Kombinatının direktoru*



Paşayev Seyfəddin Teymur oğlu 1952- ci ilin iyununda rayonun Tatar kəndində anadan olub. 1959-1969- cu illərdə qəsəbə orta məktəbində oxuyub. Sonra Azərbaycan Pedaqoji İnstitununun riyaziyyat fakültəsini bitirib. Ali məktəbi bitirdikdən sonra Zəngilan kənd orta məktəbində müəllim kimi əmək fəaliyyətinə başlayıb.

Sonrakı illərdə partiya işinə keçən Seyfədin Paşayev Rayon Partiya Komitəsində təlimatçı işləmişdir. Rayonun işğalı ərəfsində Əhaliyə Məişət Xidməti Kombinatının direktoru idi. Rayonun işğalından sonda 20 ilə yaxın rayon İcra Hakimiyəti başçısının I müavini olmuşdur. Seyfəddin Teymur oğlu hal-hazırda Dövlət qulluğu təqaüdündədir.

**Paçayev Yavər Əli oğlu**

*Polis mayoru. Zəngilanın ilk həvəskar aktyorlarından biri*



60-70-ci illərdə Zəngilan şəhərində küçələrə vurulan afişalarda tez-tez belə bir məlumata rast gəlirdik. Konserti idarə edirlər Yavər Paşayev və Məhəmməd Hüseynov. Onların hər ikisi anadan gəlmə aktyor, çülüş ustaları idilər. Rayon Mədəniyyət evində keçirilən bu tədbirlərdə o dövrün bürokratları, rüşvətxorları tənqid olunur, məsxərəyə qoyulurdu. Bunları tamaşaçılara çatdıranlar isə Yavərlə Məhəmməd idi. Hər ikisi rayonda doğulub boya-başa çatan gənclər idi.

Yavər Əli oğlu Paşayev 1949-cu ildə Pirçivan kəndində anadan olub, 1957-1967-ci illərdə Zəngilan qəsəbə orta məktəbində təhsil almış, 1968-1970-ci illərdə sovet ordusu sıralarında xidmət etmişdi. Ordudan tərxis olunandan sonra Zəngilan rayon Milis şöbəsində milis məfəri kimi əmək fəaliyyətinə başlamışdır. Bir müddət sıravi milis kimi çalışandan sonra Bakı milis məktəbinə oxumağa göndərilmişdir. Yavər Paşayev 1974-cü ildə milis məktəbini əla qiymətlərlə bitirir.

1979-cu ildə Oğuz rayonuna işə göndərilən həmyerlimiz zabit kimi xidmətə başlamış, bir müddət sonra yaxşı xidməti nəzərə alınaraq ona milis mayoru rütbsi verilmişdir. Sonra onu cinayət axtarış bölməsinə baş əməliyyatçı təyin edirlər. On ilə yaxın bir müddətdə bu vəzifədə çalışan Yavər Paşayev Qarabağ müharibəsi zamanı Zəngilan, Şuşa, Füzuli, Laçın rayonlarında zalım düşmənə qarşı aparılan əməliyyatlarda yaxından iştirak etmişdir.

İşinə diqqətlə yanaşması və qüsursuz xidməti sayəsində 1993-cü ildə onu Oğuz rayon Daxili İşlər Şöbəsinə rəis müavini təyin edirlər. Bu vəzifədə o daha cox işlər görmək istəyirdi və təbii ki, buna qadir idi. Lakin sən saydığını say gör..... 1993-cü ilin 25 iyu-

nunda Yavər Paşayev avtomobil qəzası nəticəsində faciəli sürətdə həlak olur. Qüsursuz işinə görə DİN tərəfindən dəfələrlə fəxri fərman və mükafatlarla təltif olunmuşdur.

**Sayılova Əntiqə İsfəndiyar qızı**

*Dünyada ən uca zirvədir ana*



Dünyanın misli-bərabəri olmayan varlığı, yaranışın əsl möcüzəsi anadır. Sözlərlə ifadə edilə bilməyən fədakarlığı və qarşılıqsız sevgini özündə ehtiva edən yeganə varlıq anadır. Qiyməti ölçülməyən tək ana sevgisidir. Ana o qədər ilahi və müqəddəs varlıqdır ki, vətən də onun ismi ilə «ana vətən» adlandırılır. Analara ən yüksək qiyməti Məhəmməd Peyğəmbər(s.ə.s) verib: «Cənnət anaların ayaqları altındadır»

Eyni zamanda nə gözəl atalar sözümüz var «Ana haqqı, Tanrı haqqı» İslam Səfərlinin sözləri ilə isə desəm,

*Gözümün nuru, canım ana,*
*Böyütdün sən məni yana-yana.*
*Odlusan gün kimi, bu qaynar həyat kimi,*
*Borcluyam mən sənə, sənə bir övlad kimi,*

Əziz ana!

Anam Sayılova Əntiqə İsfəndiyar qızı sayılıb-seçilən bir nəslin qızı və köklü bir nəslin sevimli gəlini idi. Anamın xarakterindəki yüksək nəcabətlik və ədəb-ərkan onu  hər iki tərəf qohumlar arasında sevimli etmişdi.Anamda o qədər böyük kübarlıq var idi ki...Gözəllər gözəli anam, saf, təmiz anam, ipək qəlbli anam, kimsənin qəlbinə toxunmayan anam, bir kimsədən küsüb inciməyən geniş ürəkli, mehriban  anam, səliqə-sahmanlı anam,

işgüzar, bacarıqlı, çox qabiliyyətli, barmaqları qızıl olan anam, ziyalı, xanım-xatun anam, süfrəmin bəzəyi anam, sirdaşım anam sənin o qədər, saysız-hesabsız gözəl xüsusiyyətlərin var idi ki, sayıb qurtara bilmirəm... Atamın sözləri ilə desəm,

*Həyatda anadan nədir müqəddəs?!*
*O hansı varlıqdır anadan əziz,*
*Məhəbbəti günəş, qayğısı dəniz?!*
*O, ana deyilmi, ayrılan canı,*
*Ürəkdən, ciyərdən qopan parçanı*
*Böyüdüb dünyanın edir ziynəti.*
*Alqış ey analıq əbədiyyəti!*
*Vətənin rəmzisən müqəddəs ana,*
*Mən səni görürəm baxsam hayana.*
*Gülürsən hüsnündə təzə güllərin,*
*Təzə nəsillərin, təzə illərin,*
*Var olsun analıq, yaşasın həyat,*
*Analıq eşqilə gülsün kainat!*

Anam 1934-cü ildə dünyaya göz açıb. Gözəlliyi, istiqanlılığı, işgüzarlığı ilə uşaqlıqdan sevilib. Orta məktəbi əla qiymətlərlə bitirib. Əmək fəaliyyətinə 1953-cü ildən başlayaraq əvvəlcə Zəngilan qəsəbə orta məktəbində kitabxanaçı işləyib. Sonra isə təhsilini artıraraq 1964-cü ildən köçkünlük həyatına kimi Zəngilan şəhər 1 saylı orta məktəbində ibtidai sinif müəllimi işləmişdir. İşlədiyi müddətdə məktəbdə qabaqcıl müəllim olmuş və dəfələrlə nümunəvi fəaliyyətinə görə «Fəxri Fərman» larla təltif olunmuşdur. Onun saysız-hesabsız şagirdləri yüksək savadları ilə seçilərək müxtəlif ali məktəblərə qəbul olunmuş, bitirmiş və vətənə layiqli mütəxəssislər olaraq öz xidməti vəzifələrini ləyaqətlə yerinə yetirərək öz doğma müəllimlərini də heç vaxt unutmayıblar. 1974-cü il məzunları 2004-cü il oktyabrın 3-də Bakıda «Çinar» şadlıq sarayında, 1975-ci il məzunları isə 2005-ci il mayın 15-

də «Yeganə» şadlıq sarayında öz doğma müəllimləri ilə 30 illik yubiley görüşlərini keçirmişlər. Hətta 1975-2005(30 il) görüşü Azərbaycan televiziyasında Azər Mirzəyevin «Görüş yeri» verilişi ilə yayımlanmışdır. Bütün bunlardan başqa şagirdləri vaxtaşırı evimizə anamı ziyarətə gələrdilər.Bütün bunlar müəllim ucalığının təntənəsidir. Anam məktəbdə müəllim, evdə də ana olaraq işinə sonsuz həvəslə can yandırardı. Həyat yoldaşına isə ağayana qulluğu ilə əsil Azərbaycan xanımına xas olan məziyyətlərə sahib olan bir xanım idi. Onun bütün bu xüsusiyyətlərini sağlığında atam «Ömür yoldaşıma» adlı şeirində o qədər gözəl tərənnüm edib ki, mən həmin şeiri bütöv şəkildə verməyi özümə borc bilirəm.

**Ömür yoldaşıma**

Ay mənim mehriban, qeyrətli yarım,
Namuslu, həyalı, ismətli yarım,
Şirin övladlardan qismətli yarım
Sənsiz bir günüm də olmasın mənim,
Gülüm- gülüstanım solmasın mənim.

Hüsnə tən gələndə ağlı, kamalı
Ürəyə od salır yarın camalı.
Səni belə duycaq şair xəyalı,
Sandım ki, qəlbimi almısan mənim,
Canıma eşq odu salmısan mənim.

Güllü bağçanızda, doğma məktəbdə,
Səni hər görəndə huri ədəbdə,
Kölgən tək süründüm çılğın bir təbdə
Bir yaz səhərini açıb xeyirlə
Sevgi məktubumu yazdım şeirlə.

Halal süd əmmiş tək düşdün baxtıma,
Gənc müəllim kimi kasıb vaxtıma.
Ancaq zinət oldun tacı- taxtıma.
Nişan da verildi, toy da vuruldu,
Ülvi məhəbbətlə həyat quruldu.

Biz bu məhəbbətlə yaşayırıq bax,
Halallıqla ad-san daşıyırıq bax,
Təmiz ürəkləri oxşayırıq bax.
Bax budur ən zəngin var-dövlətimiz,
Xoşbəxt taleyimiz, səadətimiz.

Bəyənib sevmişəm bir ilk baharda,
Xoşbəxtlik tapmışam vəfalı yarda,
Üz turşutmamısan çətində, darda.
Dar gündə dayağım olmusan mənim,
Dəryada mayağım olmusan mənim.

Könlü tox, gözü tox nəcib insan tək
Ömür yoldaşına olmusan kömək.
İnsanlıq, halallıq, şərəfli əmək
Yolunda yoldaşım olmusan daim,
Sadiq məsləkdaşım olmusan daim.

İşini görmüsən sən yana-yana,
Məktəbdə müəllim, evdə də ana.
Ərin qulluğunda çox ağayana.
Qayğıların vermir sənə əziyyət,
Əsil qadınlarda budur məziyyət.

Qaynanan anama əla xidmətdə,
Qohumlara açıq qəlblə hörmətdə,
Övladlar böyüdüb saf təbiətdə
Həmişə qayğıma qalmısan mənim,
Qəlbimi heyrətə salmısan mənim.

Uşaqlar böyüyüb, şükür Allaha!
Onlardan nigaran olmarıq daha.
Bizi batırmazlar heç vaxt günaha.
Ağılla, hünərlə, halal zəhmətlə
Xoşbəxt yaşayırlar eldə hörmətlə.

Üç oğul, iki qız böyütmüşük biz,
Beşi də ağıllı, işgüzar, əziz.
Onlarla qoy davam etsin nəslimiz
Zəhmətkeş, xeyirxah, alicənab tək,
Budur ürəyimdən keçən ilk istək.

Övladlar da bizə özümüz kimi,
Qəlbimiz, canımız, gözümüz kimi,
Əyriləri kəsən düzümüz kimi
Üzüağ durublar xidmətimizdə,
Hörmət artırırlar hörmətimizdə.

Sən uşaqlarımın gül anasısan,
İndi də mənimçün su sonasısan.
Mənalı ömrümün pak aynasısan.
Bu ayna həmişə qoy parlaq olsun!
Ömrün uzun olsun, üzün ağ olsun!

Yaxşı ki, qızlar da oxşayıb sənə,
Saflığa, paklığa gəriblər sinə.
Çəkiblər ananın tərbiyəsinə.
Qız zərif məxluqdur, çıçəkdir çiçək,
Üstünə bir toz da qonmasın gərək!

Adın Əntiqədir, özün Əntiqə,
Əqidən əntiqə, sözün əntiqə.
Yazdım bu şerimdə düzün, Əntiqə.
Qoy hamı oxusun xəbərdar olsun,
Sənin tək yar-yoldaş daim var olsun!

Artıq mən babayam, sən də nənəsən,
Düzlükdə, saflıqda bircə dənəsən.
Az qalmısan eldə pirə dönəsən.
Sən mənə əvvəldən ocaqsan, pirsən,
Hurisən, mələksən, gülsən, çiçəksən.

İşğalda qalsa da ev-eşiyimiz,
Arxadır övladlar, ötüşürük biz.
Təki möhkəm olsun sülh keşiyimiz.
Övladlar yaşasın xoşbəxt, firəvan,
Biz də yüz yaşayıb olarıq cavan.

Biz ilk dil açanda da «ana» deyirik, ən ağrılı halımızda da «ana» çağırır, sevinəndə gözlərimiz o müqəddəs varlığı axtarır. Təəssüf ki, analı günlərin ömrü çox da uzun olmur. Nə vaxtsa ana itkisi qapımızı döyür. 2017-ci il 26 noyabr...anamızı itirdiyimiz gün...Canım ana, sən atana nə yaman sadiq oldun, can ana, İsfəndiyar baba dünyasını dəyişən gün, 26 noyabrda sən də ona qovuşdun... Hələ də yoxluğuna inana bilmirəm. Axı sən rayona qayıtmaq həvəsində idin. Bilirəm indi ruhlarınız şaddır ki, torpağımız azaddır. Ancaq mən o yerləri sizsiz təsəvvür edə bilmirəm. Mənə çox çətindir sizsiz o yerləri görmək...Elə bil əllərim havadan asılı qalıb, elə bil ürəyim boşluqda qalıb, o boşluğu kaş ki, sənin nəfəsinlə doldura biləydim... Sənsiz keçən günlərimi mən heç gün saymadım ki, mənim gözəllər gözəli, xanım-xatun anam...Zakir qardaşım sənə əmanət, atam sənə əmanət, gözümün işığı, başımın tacı, mənə həyat verən həyatım ana, sözü, nəsihəti ruh ehtiyacım, mənliyi, qüruru uca dağ olan, övladı yolunda çil-çıraq olan, uçan tərlanların qanadı anam...Qucağına köçdü anam, torpaq anam əmanəti, laylasını çal anamın, şirin-şəkər bal anamın, sən könlünü al anamın, torpaq anam əmanəti, bir yanan çıraq idi, torpaq anam əmanəti, şöhrət yurdu ağlar qaldı, el-obası yas saxladı, torpaq anam əmanəti, torpaq anam anası ol, torpaq anam əmanəti...

Sən hər zaman işığınla yolumu aydınlatdın, hər zaman qoruyucu mələyim oldun, canım anam, məkanın cənnət olsun...

**Tərlan Əliyeva**

## Səlimov Nəcəf Əmir oğlu

### Pirçivanın «Məscid düzü» məhəlləsinin fəxrlə adı çəkilən sakinlərindən biri....




**Nəcəf Səlimov Ukraynanın Novqorod şəhərinin 100 illik tədbirində Azərbaycanı təmsil edir.**

Bəri başdan bildirirəm ki, mənim bugünki qəhrəmanım Nəcəf Əmir oğlu Səlimovdur. Atası Əmir əmi, anası Fazilə bacı məhəlləmizin ən sakit, ən mülayim adamlarıydı, sağ ikən özlərinə rəhmət qazanmışdılar. Pirçivan kəndinin (indiki Zəngilan şəhəri) tam mərkəzindəki Məscid düzü ətrafında evləri olan insanlar bu yaşayış məntəqəsinin ən qədim sakinləri olmaqla, hamısının bir-biri ilə qohumluq əlaqələri var idi. Bizim ailəmizin də Nüvədi kəndindən olan yaxın qohumları bu məhəllədə yaşayırdı.

Mən, Nəcəfgilin ailəsindən ilk olaraq Fazilə bacını tanıyırdım. O, M.C.Bağırov adına kolxozun nəzdindəki Uşaq Bağçasının müdiri işləyirdi. Anamı erkən itirdiyimdən (1951-ci il) məni də həmin bağçaya qoymuşdular. Bağça kolxoz idarəsinin binasındakı iki otaqda yerləşirdi. Fazilə bacı çox vaxt özü mənə qulluq edirdi. Böyük qardaşım Şamı da kolxozun baş mühasibi idi. Əmir əmi əslən İçəri Müşlan kəndindən olmaqla atamın yaxın qohumlarından sayılırdı. Çox həyalı insan idi. Hərdən bizə gələr, atamla şirin-şirin söhbət edərdi. Boy-buxunu, zahiri görünüşü də atama bənzəyirdi. Hər ikisi dərzi Mustafa kişiyə uzun dimdik şapka tikdirər, onu başlarına qoyanda bu oxşarlıq daha da artardı. Atam Əmir əmidən 10-12 yaş böyük olardı.

Bir dəfə Əmir əmi qanı qara vəziyyətdə bizə gəlmişdi, atama nə isə demək istəyirdi. Məsələni mənim yanımda açmaq istəmirdi. Mən bunu duydum və onlardan aralanıb həyətimizə getdim.



**Nəcəfin anası Fəzilə xanım**

Fazilə bacı da anamın qohumu idi. Onların evi Qurbangilin, Mansırgilin evləri ilə bitişik idi. O dövrdə evlərin üstündə dam (krışa) qurulmurdu. Axşamlar onların evlərinin üstündə gizlənpaç oynayardıq. Nə Əmir əmi, nə də Fazilə bacı bir dəfə də olsun bizə acıqlanmaz, bizi qovmazdı. Halbuki, bizim hay-küyümüzdən, tavandan tökülən torpaqdan onların evlərində oturmaq çətin olardı.

Əmir əmigil 1964-cü ilədək məhəlləmizdə yaşadılar. Onlar, «İsti-su» deyilən çeşmənin yaxınlığındakı «İpək İdarəsi» (Rayşolk) məhəlləsində özlərinə ev tikib ora yığışandan sonra bizim qonşuluğumuz sona çatdı. Lakin, qohumluq, isti münasibətlər, get-gəl daha da yüksək səviyyədə inkişaf etməyə başladı. Əmir əmi atamı özünün ağsaqqalı, Fazilə bacı Şamını özünə qardaş, Şəfiqəni isə bacı bilirdi. Əmir əminin övladları: Rafiq (2021-ci ildə dünyasını dəyişib. Allah rəhmət eləsin, qəbri nurla dolsun.), Niyaz, Validə,

Hüseyn, Tovuz və Nəcəf bütün həyatları boyu dünyanı dərk edəndən Şamını dayı, Şamının həyat yoldaşı Şəfiqəni isə özlərinə xala bilmişdilər. Bu indi də belədir.

Əmir əmi Allahın ona verdiyi ömrü (1902-1978) 76 yaşında başa vurdu. Fazilə bacı isə cəmisi 56 il yaşadı. Hər ikisinə Allah rəhmət eləsin! Əmir əmiyə ailənin böyük oğlu Rafiqin toy məclisini və ilk nəvəsi Mətanəti görmək nəsib olmuşdu. Fazilə bacı Nəcəflə Tovuzdan başqa qalan övladlarının toylarında iştirak edərək onlara xeyir-dua vermişdi.

Uşaqlar Zəngilan şəhərindəki orta məktəbi bitirdikdən sonra təhsillərini Bakıda və Sumqayıtda davam etdirmiş, bəzisi ixtisas aldıqdan sonra rayona qayıtmış Rafiqlə Nəcəf isə Sumqayıt şəhərinin sakinləri kimi orada yaşamağa qərar vermiş, ev-eşik, ailə-uşaq sahibi olmuşdular. Onlar Sumqayıtda yaşasalar da dədə-baba yurdlarını heç vaxt unutmamış, həmişə xeyirdə-şərdə qohumların və qonşuların yanında olmuşlar.

Əmir əminin və Fazilə bacının 4 oğlu və 2 qızı həddi-buluğa çatdıqdan sonra Azərbaycan adət-ənənələrinə uyğun ailə həyatı qurmuşdur. Onların övladlarının demək olar ki, hamısı ali təhsillidir.

Bugünki, yazımın qəhrəmanı Nəcəf Səlimov 17 mart 1962-ci ildə Zəngilan qəsəbəsində anadan olmuşdur. O, 1978-ci ildə Zəngilan şəhər 1 saylı orta məktəbini bitirmiş, əmək fəaliyyətinə Zəngilan Rayon İpək İdarəsində fəhlə kimi başlamışdır. 1980-1982-ci illərdə Sovet ordusunda hərbi xidmətini başa vurduqdan sonra bütün həyatını Sumqayıt şəhərinə bağlamışdır. N.Səlimov Sumqayıt şəhərindəki təsərrüfat hesablı Mərkəzi Univermağa fəhlə kimi qəbul edilmiş, şəxsi bacarığı nəticəsində orada anbar müdiri və uşaq şöbəsində rəhbərliyə qədər ucalmışdır. N.Səlimov təhsilini də artırmağı unutmayıb. O, əvvəlcə Bakı şəhərindəki Ticarət texnikumunun əmtəəşünaslıq fakültəsini, sonra isə işləyə-işləyə Sumqayıt politexnik texnikumunun gömrük fakültəsini bitirmişdir. Nəcəf Səlimov 1993-cü ildə Ulu Öndər Heydər Əliyevin

sahibkarlığın inkişafı ilə əlaqədar sərəncamından sonra kiçik bizneslə məşğul olmuş və hazırda da bu işini uğurla davam etdirir.

N.Səlimov 1986-cı ildə yaxın qohumu ilə ailə həyatı qurmuş, bu xoşbəxt ailənin iki oğlu, üç nəvəsi var.

Mən 1989-cu ildən Zəngilan Rayon Kino birliyində direktor, 1992-ci ildən isə Zəngilan Rayon İcra Hakimiyyətində məsul vəzifədə işləyirdim. Ermənistan, SSRİ-nin ən hörmətsiz rəhbəri olan M.S.Qorbaçovun «xeyir-duası» ilə Azərbaycanın Qarabağ bölgəsini və ona yaxın rayonları işğal etmək ərəfəsində idi. Zəngilanda da əhali özünü müdafiə batalyonları yaradılmış, torpaqlarımızı müdafiə etməyə başlamışdılar. Həmin vaxtlarda mütəşəkkil ordumuz yox dərəcəsində idi, eyni zamanda mərkəzdən idarə olunmurdu. Belə şəraitdə Zəngilana kömək lazım idi. O zamanlar Bakıda və Sumqayıtda yaşayan nüfuzlu həmyerlilərimiz: Bəxtiyar Süleymanlı, Məmmədxan Rəsulov, Cəmil Sayılov, Məhiyəddin Abdullayev, Sofik Hüseynov, Ənvər Məmmədyarov, Mürşüd Məmmədov, Zakir və Nadir Hacıyev qardaşları, Məmməd Qasımov, Əlqəmə Orucov, Tofiq Bağırov, gənclərdən Nəcəf Səlimov, Ələkbər Mustafayev, Zülfüqar Mustafayev və digərləri bir ortağa gələrək döyüş bölgəsi olan Zəngilan üçün ərzaq, hərbi texnika, hərbi sursat, digər lazımi avadanlıqlar toplaya bilmiş, özləri ilə rayona gətirmişdilər. Bu hal 1991-ci ildən başlayaraq 1993-cü ilə qədər davam etdi. Həmin vətənpərvərlərdən ən fəalları Ələkbər Mustafayev, Nəcəf Səlimov və sonralar Zəngilan Rayon İcra Hakimiyyətinin başçısı işləmiş İlham Hüseynov idi. Çoxlarının bilmədiyi bir məlumatı çatdırım ki Zəngilanı həm ağır texnika, həm silah, həm də sursatla təmin edən Mustafayev Ələkbər Suqrət oğlu idi. Onun toxunulmazlığını təmin etmək üçün İcra Başçısı Əli Quliyev və komendant, polkovnik-leytenant İldırım Məmmədov tərəfindən təsdiqlənmiş xüsusi arayışı (vəsiqəsi) vardı. Adlarını sadaladığım adamlardan ən çox Zəngilana gələni və özü ilə lazımi avadanlıqlar gətirən isə Nəcəf Əmir oğlu Səlimov idi.

Burasını deyim ki, nə Tofiq Bağırov, nə Ələkbər Mustafayev, nə

də ki, Nəcəf Səlimov Zəngilanın ən ağır günlərində elimizə-obamıza dayaq olmalarını dilə gətirmək istəmir, öz borclarını yerinə yetirdiklərini bildirirdilər. Lakin, qardaş Türkiyədəki Türk dünyasını sarsıdan dəhşətli zəlzələdən sonra Nəcəf Səlimovun 3 nəfərlə birlikdə operativ şəkildə fevralın 8-i, 10-u və 11-də məhəllə komitəsinin sədri kimi əhalidən könüllü şəkildə topladığı 5 yük maşını yatacaq dəstini, pal-paltarı, ayaqqabıları, corabları, ərzağı və digər lazımi avadanlıqları Türkiyəyə çatdırmaq üçün Bakıya aparması mənim bu barədə həmyerlilərimə məlumat verməyimə səbəb oldu. Oxuculara çatdırıram ki, bütün faktları ondan «misqal-misqal» qopartmışam. N.Səlimovun verdiyi məlumatları heç bir düzəliş etmədən qeydə almışam. Onun söylədiklərindən:

Bir dəfə Ələkbər Mustafayevlə rayona silah-sursat gətirmişdik. Batalyon Peşə məktəbində yerləşirdi. Orada həyətdə əldə düzəldilmiş turbadan qrad hazırlayırdılar. Ehtiyacı ödəyəcək standart qradlar yox idi.

Gərgin vaxtlarda Sumqayıtda heyət yığışdı, böyük maşın karvanı ilə yola çıxdıq. 16 kamaz, arxasında qoşqusu, 32 nəfər sürücüsü, bütün maşınlar silah-sursatla dolu idi. Bizi nəqliyyat vasitəsilə Sumqayıtdakı Ərazi Avtomobil Nəqliyyatı Sənaye Tikinti Trestinin rəisi Əlqəmə Orucov təmin edirdi, yola sərf olunan yanacağı da özü verirdi. Hamısına da təmənnasız. Çox vətənpərvər insan idi. Biz dəfələrlə Tofiq həkimlə, İlham həkimlə Zəngilana getmiş, həmişə də müxtəlif yardımlar aparmışıq.

Bir dəfə Ovçular Evinin önündə Bakı və Sumqayıt ziyalıları və iş adamları yığışdıq ki, sabah saat 10:00-da rayona çıxaq. Kim-kim ilə gedəcək planlaşdırıldı. Mustafayev Zülfüqar Mansur oğlunun maşınında mən və tanımadığımız, bizdən təxminən 10 yaş böyük olan uca boylu, səliqə-sahmanlı bir şəxs də bizimlə oldu. Yol boyu ordan-burdan, iqtidar-müxalifət münasibətlərindən danışırdıq. Həmin adam da hərdən bir söz demək istəyəndə biz onunla razılaşmır, dediklərini səhv adlandırırdıq. O da bizə heç nə demirdi. Cəbrayıl rayonunun Soltanlı kəndini keçəndən

sonra o, özünü təqdim edərək hərəmizə bir vizit kartını verdi. Bu, iqtisad elmləri doktoru Sofik Kəlbi oğlu Hüseynov idi. İş işdən keçmişdi. Üzrxahlıq etmək istədik, imkan vermədi, üstəlik evinin telefon nömrəsini bizə verərək: «Mən bu gündən sizinlə əbədi dost oluram»-dedi.

Bir səfərimizdə də Cəfərov Musa mənə bildirdi ki, İcra başçısı (adını etika xətrinə yazmıram) sizi tutdurmaq istəyir, aradan çıxmaq lazımdır. O, düz deyirdi. Amma, mən və başqaları rayona həmişə mənəvi və maddi dayaq olmuşduq. Həmin üzdən iraq başçının bu qərarı nə ilə əlaqədardı? Doğrusu, heç indi də anlamıram.

Zəngilanlıların əzmkar mübarizəsinə baxmayaraq, onlar qeyri-bərabər döyüşdə 1993-cü ilin oktyabr ayının axırında doğma yurdla vidalaşmalı oldular, hamısı da Araz çayından keçməklə, evindən-eşiyindən heç nə götürmədən. Qanlı görsə, qan ağlayardı. Hər bir kəs ailəsinin, uşaqlarının təhlükəsizliyi üçün daha uzaqlara getməyə can atırdı.

-Çoxumuz Arazı keçəndən sonra bir neçə gün orada qalmalı olduq. Bir tərəfdən də güclü yağış yağırdı. Əynimizdəki kostyumla torpağın, qumun üstünə uzanıb gecələməli olurduq. (Asif Bağırov)

Mərkəzdə yaşayan Zəngilanlıların da xeyli hissəsi böyük nigarançılıqla qohum-əqrəbadan xəbər tutmaq, kömək üçün İmişli rayonunun Çaxırlı buraxılış məntəqəsinə toplaşmışdılar. Yüzlərlə Zəngilanlıların arasında Rafiq Əmir oğlu Səlimov və qardaşı Nəcəf Əmir oğlu Səlimov da var idi.

Məcburi köçkünlüyün ilk günlərindən onlar imkanları daxilində hər bir köməyə hazır idilər və bu köməyi də etdilər. Rafiq qardaşı Hüseyni ailəsi ilə birlikdə öz bağ evində yerləşdirdi. O, həmçinin işlədiyi Sumqayıt Beton Məmulatları Zavodunun inzibati binalarında bir neçə köçkün ailələrinin yaşaması üçün şərait yaratdı. Nəcəf özündən böyük qardaşı Niyazı və ailə-uşaqlarını öz evində saxladı. Səlimovlar ailəsinin sonbeşiyi Tovuz xanım isə böyük bacısı Validə xanımı ailəsi ilə birlik-

də öz evinə qəbul etdi. Rəhmətlik Rafiqlə Nəcəf qardaş-bacılarından başqa, digər qohumlara da kömək əllərini uzatdılar. Bu siyahıya Qəzənfər, Xalidə, Xansuvar və digərləri daxil idi. Nəcəf digər bağ evində əmisi oğlu Səlim müəllimgilə də hər bir şəraiti olan ev (vaqon) verdi. Lakin, Səlim müəllimgil qardaş-bacıları ilə Bakıda yaşamağı daha məqsədəuyğun bildilər.

Nəcəf Səlimov məcburi köçkünlərin qarşılaşdığı çətinlikləri, onların həyatdan küskünlüklərini çox yaxşı başa düşürdü, odur ki, onlara tez-tez baş çəkməyi də unutmurdu.

Mən Nəcəfgillə həm qonşu, həm qohum olsam da, ondkı müsbət xüsusiyyətləri, insani keyfiyyətləri 30 illik köçkünlük həyatımda tam müşahidə etdim. Bu sahədə o, heç kimlə müqayisə ediləsi deyil. Bunu bir neçə faktla sizə çatdırıram.-Asif Bağırov

Bacım Səlbigil ümumilikdə 6 nəfər olmaqla 20 il Nəcəfin bağ evində yaşadılar. Yerdən 1.5 metr hündürlükdə zirzəmisi olan bu yaşayış binası olduqca rahat idi, iki otağı, bir eyvanı var idi. Bacımgil onun zirzəmisində toyuq-cücə, ördək, qaz saxlayar, həm quş əti, həm də yumurta ilə özlərini təmin edə bilirdilər. Həyətyanı sahədə müxtəlif meyvə ağacları: yüksək çeşidli ağ və qara tut, əncir, üzüm, albalı, nar, qoz, ərik, gavalı, şaftalı var idi. Səlbi çox işgüzar olmaqla orada göy-göyərti, xiyar, pomidor, badımcan, bibər və s. əkib becərər, bazara ehtiyacları olmazdı. Həyətdəki meyvə ağacları bir tondan çox bar verərdilər. Böyük qardaşım Şamı ilə ildə üç-dörd dəfə Qurbanla-Səlbiyə baş çəkərdik. Özüm də ailə-uşaqlarımla onları yoluxmaqdan yorulmazdım. Səlbi Nəcəfdən çox razılıq edər, onun alicənablığından danışaraq deyərdi ki, həmişə xörək bişirən vaxt qazana duz tökəndə Nəcəfin ata-anasına rəhmət oxuyuram. Mövsüm aylarında biz ora gedəndə bacımın bişirdiyi ətirli plovdan sonra doyunca da meyvə yeyər, bəzən də onlardan evimizə də pay qoyardılar. Nəcəf heç vaxt bağdakı meyvələrə qoruq-qaytaq qoymazdı. Qurbanın (2013-cü ilin fevral ayı) və Səlbinin (2014-cü ilin oktyabr ayı) son mənzilə yola salınması mərasimi Nəcəfin bağ evindən oldu.

Nəcəfdə dəfələrlə müşahidə etdiyim bir müsbət xüsusiyyət də qohum-əqrəbanın xeyir-şərində fəal iştirak etməsi, məclisin axırınadək ayaq üstə olub gəlib-gedənləri qarşılayıb yola salması idi. Onunla oturub-duranlar, Nəcəfi yaxından tanıyanlar onun yüksək mədəniyyətindən, təşkilatçılığlndan, qonaqpərvərliyindən, işinə daha məsuliyyətlə yanaşmasından, insanlarla ünsiyyət yaratma bacarığından qədərincə məlumatlı idilər. Zəngilanın bir çox tanınmışları: Əsgərxan Azadov, Əziz Paşayev, Bəndalı Hüseynov, Qıraq Müşlanlı Lavka İsmayıl və digərləri həmişə asudə vaxtlarını Nəcəfin Yeni Şərq bazarındakı mağazasına yığışar, çay içə-içə söhbətləşər, özlərini sanki Pirçivanın Məscid düzündəki hamının toplaşdığı mərkəzdə hiss edərdilər.

Nəcəfin ən böyük xidmətlərindən biri də Zəngilan Rayon İcra Hakimiyyətinin rəsmləri E.Eyvazov və Ş.Ağayev vasitəsilə iki maşınla 4 min ədəd uşaq köynəyi dəstini təmənnasız olaraq Azərbaycan Neft Akademiyasının Tələbə Şəhərciyində müvəqqəti məskunlaşan Zəngilanlı uşaqlara hədiyyə etməsi idi.

Nəcəf Azərbaycanın dəyərli ziyalıları: Qulu Məhərrəmli, Tofiq Bağırov, Paralel tv və Paralel qəzetinin baş redaktoru, Sumqayıtda Baş həkim Əlisoy Şaxayev, Azərbaycan üzrə Meydan TV-nin rəsmisi Natiq Cavadlı və s. ilə daim təmasdadır. N.Səlimov incəsənətə, kinoya, teatra da çox maraqlı olub. Teatr xadimləri içərisində dostları da az deyil.

O, deyir ki, Azərbaycanın Xalq artisti Ələddin Abbasovla (Cahandar Ağa) Naftalanda tanış olmuşuq. Ə.Abbasov çox sadə və səmimi bir insan idi. Bizimlə (həkim dostum və mən) təzə tanış olsa da, çoxdanın dostu kimi danışırdı. Onun şərəfinə bir məclis təşkil etdim. Bizə «Dəli Kür» filmindən bir epizodu xatırlatdı ki, mən canlı olaraq qaça-qaça tullanıb atı minmişəm, dublyaj deyil. O, əsil Azərbaycan kişisi, Azərbaycan bəyi idi.

N.Səlimov yorulmaq bilməyən fəal ictimaiyyətçidir. O, 20 ildən çoxdur ki, Azərbaycanın ictimai-siyasi həyatında yorulmadan

fəaliyyət göstərir, Prezident və Parlament seçkilərində dəfələrlə (Sumqayıt şəhərində) komissiya üzvü və müşahidəçi olub.

Hazırda N.Səlimov Sumqayıt Bələdiyyəsi nəzdindəki 2-ci mikrorayon əhalisi, 16-cı mikrorayon və 51-ci məhəllə üzrə komitə sədri vəzifəsində çalışır.

Sumqayıt Bələdiyyəsinin sədr olduğu ərazidə görəcəyi işləri o, özü Bələdiyyə qarşısında bir məsələ kimi qaldırır.

Özünün möhürü və ştampeli var. Bələdiyyə sədrinin hesabatını qəbul etmək səlahiyyəti var. 2023-cü ildə Sumqayıt Bələdiyyəsinin 2022-ci il üçün hesabatını qəbul edərkən iclasın sədri seçilib. N.Səlimov Azərbaycandan kənarda keçirilən ən mühüm tədbirlərin də fəal iştirakçılarından biridir. O, 19 sentyabr 2021-ci ildə Ukraynanın Mirqorod şəhərinin 100 illiyi münasibəti ilə keçirilən tədbirdə daha fəal iştirak edib. Hər icma öz adət-ənənələrini, milli geyimlərini, milli mətbəxlərini nümayiş etdirirdi. Diasporun köməkliyi ilə reallaşan bu sərgidə Azərbaycanın təşkil etdiyi stendinin qarşısında insanlar növbəyə dayanmışdılar. Burada pulsuz olaraq hamıya şəkərbura, paxlava, samovar çayı, dolma, axırda isə Azərbaycan plovu verilirdi. Azərbaycan icması



**Soldan sağa Nəcəfin böyük qardaşı Rafiq, Nəcəf və Şamı Bağırov**

birinci yerdə qərarlaşdı.

N.Səlimov olduqca qohumcanlıdır. O, 2 may 2022-ci ildə Sumqayıt və Bakıda yaşayan ata-baba qohumlarımızın əksəriyyətini öz evində bir araya toplaya bildi, böyük bir ziyafət verdi. Şəxsən mən az-az gördüyüm və həsrətində olduğum bir çox yaxınlarımla Nəcəfgildə görüşdüm. Əslində, Nəcəfin məqsədi qohumlar arasında yadlaşmanın qarşısını almaq, «Biz bir şəcərənin övladlarıyıq» demək idi. Onun devizi «Gəlin yadlaşmayaq, əvvəllər olan mehriban ünsiyyətimizə qayıdaq»-demək idi. O, buna nail oldu. Öz hörmətini qohum-əqrəba yanında daha da yüksəltdi. 17 mart 2023-cü il N.Səlimovun ad günüdür. Ona bundan sonrakı həyatını da belə hörmətlə yaşamasını arzu edirəm. Ad günün mübarək! **Asif Bağırov, yazıçı-publisist.**

**Süleymanlı Bəxtiyar İbrahim oğlu**
*Polkovnik-leytenant*
*Respublika Jurnalistlər Birliyinin üzvü*



Bəxtiyar İbrahim oğlu Süleymanlı 29 avqust 1925-ci ildə Zəngilan rayonunun dağ kəndlərindən olan Bartazda anadan olub. Əmək fəaliyyətinə 1942-ci ilin iyununda başlayıb. Bir neçə ay Bartaz kəndindəki poçt bölməsinin rəisi, 1943-cü ilin mart ayından rayonun Əmirxanlı və Bartaz kəndlərində müəllim işləmişdir. 1944-45-ci illərdə Sovet Ordusunda xidmət etmiş, müharibə iştirakçısı və veteranıdır. Bəxtiyar İbrahim oğlu Süleymanlı Azərbaycan Dövlət Universitetinin hüquq fakultəsini bitirib. O, 1945-52-ci illərdə Zəngilan rayon hərbi komissarlığında məxfi işlər müdiri və bölmə rəisi vəzifələrində işləmişdir.

Bəxtiyar Süleymanlı 1952-87-ci illərdə 35 il fasiləsiz Dövlət Təhlükəsizliyi orqanlarında xidmətdə olmuş, bunun 28 ilini bu

orqanın müxtəlif rəhbər vəzifələrində çalışmışdır.

O, 1989-91-ci illərdə Azərbaycan Respublikası Elmlər Akademiyasında aparıcı konstruktor vəzifəsində işləmiş, 1991-96-cı illərdə Bakı Pedaqoji kollecində «Qanunvericiliyin Əsasları» və « İslam hüququ» fənlərindən dərs demişdir. 1995-ci ildən Mingəçevir şəhərinin fəxri vətəndaşıdır. 1960-2008-ci illərdə müxtəlif qəzetlərdə və kitablarda dərc olunan 100-dən artıq publisistik və «Xatirələr» rublikasına aid iri həcimli məqalələrin və «Yaşatmaq üçün yaşanmış yarımçıq ömür» və « Əbədiyaşarlar» elmi-publisistik kitablarının müəllifidir. Respublika Jurnalistlər Birliyinin üzvüdür.

Bəxtiyar İbrahim oğlu Süleymanlı 2021-ci ilin avqust ayında Bakı şəhərində dünyasın dəyişib. Allah rəhmət eləsin.



**Soldan sağa: Salam Cavadlı, Bəxtiyar Süleymanlı və Asif Bağırov**

## Süleymanov Koroğlu İsmayıl oğlu



Süleymanov Koroğlu İsmayıl oğlu 1950-ci ilin 23 deabrında rayonun Məmmədbəyli kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra mühasibatlıq kursunu bitirmişdir. Uzun illər rayonun müxtəlif idarə və müəssisələrində mühasib, baş mühasib, müfəttiş işləmişdir.

Mən onunla rayonun işğalından sonra şəxsən tanış oldum. Bir neçə il bir yerdə işlədik. O işini biliən, el oba dərdi çəkən elə adına layiq bir kişidi.

Süleymanov Koroğlu İsmayıl oğlu rayonun işğalından sonra Bakı şəhərində məskunlaşıb. Koroğlu elə adına layiq biridi. El təəssübü çəkən, vətənini sevən kişilərdəndi. Onun iki oğlu, üç qızı var.

-qızı Sahilə -04.10.1973-cü ildə, oğlu İslam 12.02.1975-ci ildə, qızı Ülviyyə 23.09.1978-ci ildə, qızı Xəzangül 10.06. 1980-ci ildə, oğlu Sahil isə 20.05.1984-cü ildə anadan olub.

## Şərifov Fehruz Tacəddinn oğlu



Şərifov Fehruz Tacəddin oğlu 16 mart 1936-cı ildə rayonun Seyidlər kəndində anadan olub. Zəngilan qəsəbəsində orta məktəbi bitirdikdən sonra o Azərbaycan Politexnik İnstitutunu bitirmişdir. İşğal ərəfəsinə həmin evin ailə başçısı idi. Şərifov Fehruz Tacəddin oğlu işğaldan əvvəl rayon toxuculuq kombinatında işləyirdi. Toxuculuq sexini Fehrüz təşkil elədi, açdı. Elə ki, hər şey hazır oldu və istehsala başlayanda onu işdən kənarlaşdırıb

başqasını sexə rəis təyin etdilər. Şərifov Fehruz Tacəddin oğlu aprel 2021-ci ildə vəfat etmişdir..

Yoldaşı Məhərrəmova Gülüzar Qaytaran qızı 05 sentybr 1952-ci ildə rayonun İçəri Müşlan kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra o Azərbaycan XT İnstitutunu da bitirib. İşğaldan əvvəl Rayon İstehlak Cəmiyyətinin qarajında mühasib işləyib. Onların iki oğlu, bir qızı var.

-oğlu İlqar 25 oktyabr 1974- cü ildə Zəngilan şəhərində anadan olub. 8-ci sinfi bitirdikdən sonra Bakıya getmiş Ceyranbatan qəsəbəsindəki 147-saylı Texnik PM-də oxuyub. Hal-hazırda sürücü kimi çalışır.

-qızı İlhamə 04 iyun 1976- cı ildə Zəngilan şəhərində anadan olub, 1983-1993-cü illərdə şəhər 1 saylı orta məktəbində oxumuşdur. Sonra Tibb Texnikumunu bitirib.

-oğlu Anar 05 may 1979-cu ildə Zəngilan şəhərində anadan olub. Hal-hazırda sürücü işləyir.

## Şıxəliyev Arif İdris oğlu

*Polis mayoru, SSRİ Daxili İşlər Nazirliyinin mükafatçısı*



Şıxəliyev Arif İdris oğlu 1947-ci ildə Zəngilan rayonunun Pirçivan kəndində anadan olub. Arif Şıxəliyev barədə danışmazdan əvvəl onun atası barədə bir neçə kəlimə demək istərdim. Mən onun haqqında 2001-ci ildə nəşr olunan kitabımda geniş yazmışam. Sadəcə onu qeyd edəcəyəm ki, İdris Şıxəliyev 1941-1945-ci illər müharibəsindən iki dərəcəli «Şöhrət Ordeni» ilə qayıdıb. Müharibədən sonra rayonumuzda rəhbər vəzifələrdə işləmiş, nə az nə çox, düz 26 il Rayon İcraiyyə Komitəsinin katibi işləyib. Mən də onunla 6 il bir yerdə işlədim və onu ləyaqətli bir insan kimi tanıdım.

Arif İdris oğlu Şıxəliyev 1966-cı ildə Zəngilan qəsəbə orta məktəbini bitirmişdir. Hələ orta məktəb illərində o həm yaxşı futbolçu, həm də ki, yaxşı nağara ifaçısı kimi tanınırdı. Orta məktəbi bitirəndən sonra onu Mədəniyyət şöbəsinə işə qəbul etdilər. Bu barədə onun yaxın dostu Asif Bağırov belə deyir:

-Yayda tətil günlərini biz Dərəli kəndində keçirərdik. O nənəsi Maral xalagildə, mən isə kirvəmiz İskəndər Cəfərov gildə qalardıq. Orta məktəbi bitirəndən sonra onu rayon Mədəniyyət şöbəsinə mədəni yaylaq Çadırına, məni isə avtokluba müdir qəbul elədilər.

Hərbi xidmətini Qazaxıstanın Şevçenko şəhərinə keçirib. Ordudan tərxis olunanda sonra Zəngilan milis şöbəsinə işə qəbul olundu. Bir neçə il işlədikdən sonra onu zəmanətlə Bakı Xüsusi Milis məktəbinə göndərdilər. 1971-1973- cü illərdəki uğurlu təhsildən sonra məktəbi bitirən Arif İdris oğlu Şıxəliyevi leytenant rütbəsində Naxçıvan Muxtar Respublikasına işə göndərdilər. Sonrakı illərdə o Qubadlı rayonunda işlədi. Bundan sonra o Zəngilana döndü. İllər ötür onun rütbəsi də, işi də böyüyürdü. O Zəngilan Polis şöbəsində ictimai təhlükəsizlik bölməsinin rəisinə qərdər yüksəldi.

1974- cü ildə ailə quran Arif İdris oğlu Şıxəliyevin Cəvahir, Ramil və Rahib adlı üç övladı var.

Arif Şıxəliyev öz işinə vicdanla yanaşan bir vətən oğlu, yurdsevər idi. Onun fəaliyyəti dövründə aldığı mükafatları sadalamağa gərək yoxdur. Mən onlardan sadəcə bir neçəsini qeyd edəcəyəm. Bilirsiniz ki, o dövrdə biz Moskvaya tabe idik. Müttəfiq Respublikaların öz xidmət orqanları ilə yanaşı onlarlın tabe olduğu daha yüksək idarələr var idi. Arif Şıxəliyev SSRİ DİN-nin11 oktyabr 1975- ci il tarixli 497- L 5 əmri ilə 2- ci dərəcəli «Qüsursuz xidmətə görə» medalı ilə təltif olunub. Sonra isə o yenə də SSRİ DİN-nin əmri ilə 1-ci dərəcəli «Qüsursuz xidmətə görə» medalı ilə təltif olunub.

Onun Rayon Partiya komitəsindən, Rayon İcraiyə komitəsin-



**Şıxəliyev Arif milis yoldaşları ilə birlikdə**

dən aldığı mükafatları və «Fəxri fərman»ları sadalamağa gərək yoxdu. O eyni zamanda Azərbaycan SSR Daxili işlər Nazirliyinin 27 noyabr 1989 –cu il tarixli əmri ilə «Fəxri fərman»la təltif olunub.

Sovetlərin çöküşündən sonda başımıza gələn bəla-hayların torpaqlarımıza xaincəsinə basqını Afirin də həyatında mühüm rol oynadı. Artıq yaşı 40-ı keçmiş bir polis işçisinin bu yaşda dağa-daşa düşüb mənfur düşmənə qarşı vuruşması asan deyildi. Arif bu işdə lap öndə gedənlərdən oldu. Axı vətəni, ananı qorumaq önə çıxanda bu yaşa, cinsə baxmır. Yenə də Asif Bağırovun yazısına müraciət edək:

-1989 -cu ilin avqust ayının biri idi. Gecədən xeyli keçmişdi. Arif iki polis işçisi ilə Seyidlər kəndində gecələyirdi. Gecə saat üç olardı. Güllə səslərinə özünü bayıra atdı. Yoldaşları da onun da-

lınca. Kəndin arası ilə irəliləyən maşından ətrafa od püskürürdü. Arif birbaşa maşının qabağına yüyürdü.....Maşın dayanan kimi tapançanı onlar tuşladı :-Silahları yerə qoyun və maşından düşün.

Onları tərksilah edib rayon mərkəzinə gətirdi.

Arif İdris oğlu Şıxəliyev 90- cı illərdə Qarabağa ezam edildi. O ən çətin mövqelərdə təhlükəli yerlərdə oldu.

1996-cı ildən isə Qaradağ rayon polis idarəsinin 2-ci polis bölməsinə xidməti işinə davam etdi.

Yazımı yenə də Asif Bağırovun sözü ilə bitirirəm:

Arif abırlı adam idi. Hörmətli nazirimiz (sabiq-Ə.S) Ramil Usubovla bir yerdə oxumuşdu. Bildiyinə görə nazirin ona hörməti var idi. Amma Arif bu yaxınlıqdan istifadə etməyi sevməzdi, qürurlu insan idi. Atası İdris Şixəliyev kimi.

Arif İdris oğlu Şıxəliyev 2006- ci ilin fevral ayının 28-də dünyasını dəyişmişdir. Allah rəhmət eləsin. Onun iki oğli, iki qızı var

**Şıxəliyev Cəbrayıl Əli oğlu**

*Zəngilanın işğalını qəbul etmək istəməyən yenilməz insan*



Tanışlıq üçün qısa məlumat

O, 1951-ci ilin oktyabr ayının 24-də Zəngilan rayonunun Bartaz kəndində anadan olub. 1958-ci ildə kənddəki məktəbin I sinfinə gedib. Məktəb VIII illiyə çevrildiyindən orta təhsilini 1968-ci ildə Zəngilan şəhərindəki 1 saylı orta məktəbdə başa vurub. 1974-cü ildə indiki Azərbaycan Dillər Universitetinin İngilis-Azərbaycan dili fakültəsini bitirib. Göndərişlə Zəngilanın Bartaz dayanacağı və Dəlləkli kənd məktəblərində ixtisası üzrə müəllim işləyib. Peşəsinə məsuliyyətlə yanaşan Cəbrayıl müəllim 1989-cu ildə Bartaz dayanacağı kənd orta məktəbinə direktor təyin edilib. Məlum ha-

disələrdən sonra 1993-cü ilin oktyabr ayında ailə və uşaqları ilə birlikdə Bakı şəhərinə pənah gətirib.

O zaman Zəngilan Rayon Təhsil Şöbəsinin müdiri Tofiq Heydərovun və bir neçə məktəb direktorunun gərgin əməyi sayəsində 1994-cü ilin fevral ayında ilk Zəngilan məktəbləri açıldı. Məktəb üçün bina, sinif otaqları tapmaq, şagird və müəllim personalını bir yerə yığmaq kimi çətin bir işin ağırlığı, əsasən, yenicə təşkil edilən məktəblərin direktorlarının üzərinə düşürdü. İşin başlıca çətinliyi isə Zəngilan axırıncı işğal rayonu olduğundan Bakıda, Sumqayıtda və digər bölgələrdə nəinki məktəb, hətta məcburi köçkünlərin özlərinin yaşaması üçün boş yer tapmaq müşkül məsələ idi.

Belə vəziyyətdə Cəbrayıl Şıxəliyev müvəqqəti məskunlaşdığı Binəqədi rayonunda minimal tələbləri ödəyə bilən Zəngilan rayonu 4 saylı orta məktəbini yarada bildi. O dövrdə pedoqoji kadrları və texniki işçiləri işə qəbul etmək səlahiyyəti direktorlara həvalə edilmişdi. İlk mərhələdə nümunəvi kollektiv yarada bilən C. Şıxəliyev getdikcə məktəbin şəbəkəsini genişləndirməyə, müəllim və şagird kontingenti arasında möhkəm nizam-intizam bərpa etməyə nail oldu. Az müddətdən sonra 4 saylı orta məktəb nəinki Zəngilanda, habelə məcburi köçkün rayonları arasında təlim-tərbiyə sahəsində öndə gedən məktəblərdən birinə çevrildi. Cəbrayıl müəllim Təhsil Şöbəsində Şura üzvü seçildi.

O dövrə qədər Cəbrayıl müəllimin adını eşitsəm də onunla heç vaxt təmasda olmamışdım. O, Şura iclaslarında problemli məsələlər barədə söz açar, onun həlli yollarını birgə axtarmağa çalışardı. Hamıdan seçilərdi, buna səbəb yaşına uyğun olmayan, vaxtından əvvəl ağarmış uzun saqqalı idi. Zəngilanın işğal günlərində 42 yaşı yenicə tamam olmuşdu. Onun nəyə görə saqqal saxladığını biləndə boy-buxunca yığcam olan Cəbrayıl müəllim mənim gözümdə əzəmətli uca bir dağa döndü. O, Zəngilanın işğalını qəbul edə bilmirdi. İndi gənclərimizin əksəriyyəti saqqal saxlayır, bəzisinə yaraşır, bəzisinə yox. Cəbrayıl müəllimin saxla-

dığı isə itirilmiş torpaqların xiffəti, dərd, möhnət, qeyrət, şəhidlərimizin adını uca tutmaq, başımıza gələn müsibətlərlə barışmazlıq əlamətləri idi. O, bir ildən artıq belə görkəmdə yaşadı. Böyük qardaşı Həmdulla müəllimin oğlu, hazırda polis sistemində polkovnik-leytenant rütbəsində xidməti vəzifəsini şərəflə yerinə yetirən Bərxudar Şıxəliyevin yalvar-yaxarı, dəfələrlə təkidli xahişi ilə saqqalı ilə «vidalaşdı» . Həmin vaxtlarda mən onun simasında heç vaxt təbəssüm görmədim.

Bu səbəbdən qəlbimdə onun qeyrəti qarşısında baş əyib, ünsiyyət yaratmağı qərarlaşdırdım. Bu arzum tezliklə reallaşdı, səlahiyyət dairəmə 4 saylı məktəb də daxil edildi. Burasını bildirirəm ki, vəzifəm inspektor adlandırılsa da mən özümü məsləhətçi kimi aparırdım. Sonralar inspektor adı məsləhətçi adlandırıldı. Bu, mənim xarakterimə, davranışıma daha uyğun idi. Zəngilan 4 saylı orta məktəbi ilə, onun direktoru Cəbrayıl müəllimlə daha yaxından tanış oldum. Doğrusu, bu məktəb səlahiyyət dairəmdəki məktəblərin əksəriyyətindən bütün istiqamətlər üzrə üstünlük təşkil edirdi. Məktəbdə əmək intizamı möhkəm, şagirdlərin dərsə davamiyyəti və hazırlığı qənaətbəxş idi. Bunun nəticəsində tədris proqramı uğurla həyata keçirilirdi. Bir qayda olaraq ölkənin ali və orta ixtisas məktəblərinə qəbulda bu məktəbin xüsusi çəkisi vardı. Məktəb getdikcə böyüyür, paralel siniflər açılırdı, burada işini sevən, mükəmməl biliyə sahib müəllimlər çoxluq təşkil edirdi. Cahan Cabbarova (dil-ədəbiyyat), Oktyabr İsgəndərov (kimya) və s. belələrindən idi. Onların çəkdikləri zəhmət həmişə hiss olunurdu.

Artıq 4 saylı orta məktəb rayonda bir növ metodiki mərkəzə çevrilmişdi. Fənn olimpiadalarında, test imtahanlarında komissiya üzvlərinin çoxu da bu məktəbdən olardı. Məktəbdən kənar, sinifdən xaric tədbir və yığıncaqların, görüşlərin, ədəbi-bədii kompazisiyaların demək olar ki, hamısı bu məktəbdə keçirilirdi. İcra Hakimiyyətinin, Təhsil Şöbəsinin, Ağsaqqallar Şurasının bir sıra tədbirlərinə 4 saylı orta məktəb ev sahibliyi edərdi.

Zəngilan rayonunun ilk məktəblərindən sayılan Bartaz kənd məktəbinin 90 illiyi Cəbrayıl müəllimin bir başa təşkilatçılığı ilə 2002-ci ilin aprel ayının 17-də Alov Qüllələrinin yerindəki Moskva mehmanxanasında keçirildi və Azərbaycan TV-də nümayiş etdirildi. Bartaz kənd məktəbinin yağlı boya ilə kətan üzərində işlənmiş iri həcmli şəkili də verilişə sanki bir canlanma verirdi. Əlbəttə, bu şəkil Cəbrayıl müəllimin ailə büdcəsinin hesabına başa gəlmişdi. «Görüş yeri» adı ilə təqdim edilən bu verilişin ssenari müəllifi Cəbrayıl müəllimin tələbə yoldaşı Bəxtiyar Səttar oğlu idi.

2010-cu ilin may ayının 5-də şair, jurnalist, ehtiyatda olan təhlükəsizlik orqanları polkovniki Mahir Cavadlının poeması əsasında 4 saylı orta məktəbdə Zəngilan, Şuşa İcra Hakimiyyətləri başçılarının müavinləri, digər köçkün rayonlarının icra və təhsil işçiləri, Azərbaycan təhlükəsizlik orqanlarının veteranları, ictimaiyyətinin nümayəndələri, poemanın müəllifinin özündən böyük qardaşları- «Şərəf nişanı» ordenli neftçi Sahib Cavadlı bir sıra kitabların müəllifi Salam Cavadlı, Zəngilanda çox sayda abidələrin müəllifi və rəssam Cavad Cavadlı, Azərbaycanın Milli Qəhramanı Riad Əhmədova həsr olunan ədəbi-bədii xatirə gecəsində iştirak edirdilər. Bu maraqlı tədbirin iştirakçıları arasında Riadın anası və bacısı da var idi. Məktəbin dil-ədəbiyyat müəllimi Cahan Cabbarovanın poemanın şagirdlər tərəfindən yüksək səviyyədə ifa edilməsində xüsusi əməyi olmuşdu. Bundan əlavə könüllülük prinsipi əsasında 2003-cü ilin avqust ayında təşkilati işlərinə başlanan, 8 məcburi köçkün rayonları məktəblilərinin bir neçə mərhələdən ibarət, 2004-cü ilin noyabr ayında yekunlaşan Azərbaycan dili və Azərbaycan əlifbası gününə həsr edilən müsabiqədə Zəngilan rayonu 4 saylı orta məktəbin finala çıxması, finalda Ağdam, Füzuli rayonlarına gəlib gəlməsi, yekunda iştirak edən 4 nəfər şagirdin hər birinə «EXXON mobile» şirkəti tərəfindən hədiyyə edilən video-maqnitafon Zəngilan rayonu təhsilinə verilən ilk mükafat idi. Qeyd edək ki, şagirdləri hazırlaşdıran

Cahan Cabbarova, yekun müsabiqədə jürinin sədri tanınmış dilçi alim, professor Afaq Qurbanov idi. Bu müsabiqənin qalibi olmaq Zəngilan rayonu 4 saylı orta məktəbinə böyük şöhrət gətirdi. Cahan Cabbarova 2005-ci ildə qazandığı uğurlara görə Ölkə prezidenti İlham Əliyevin sərəncamı ilə «Tərəqqi medalı» ilə təltif olundu.

Məktəbin qazandığı uğurlara görə direktor C.Şıxəliyev 2002-ci ildə Təhsil Nazirliyi Kollegiyasının «Fəxri Fərman» ına layiq görülmüşdü. 2008-ci ildə Azərbaycan Müəllimlərinin XIII qurultayına nümayəndə seçilən Cəbrayıl Şıxəliyev sonralar da bir sıra sanballı tədbirlərə ev sahibliyi eləmişdi. 2010-cu ilin axırlarında Respublikasının Əməkdar müəllimi Hacı Miriş Zəngilanlının yaradıcılıq gecəsinin keçirilməsi, 2012-ci ilin fevralında Zəngilanın ilk generalı Məhəmməd Əsədova həsr edilən yığıncağın keçirilməsi ən yüksək səviyyəli tədbirlər idi. Bu səpkidə yığıncaqların keçirilməsi müəyyən vaxt, xeyli hazırlıq tələb edirdi. Tədbirlərin iştirakçıların arasında həmişə adlarını ehtiramla çəkdiyimiz Bəxtiyar Süleymanlını, Hürü Mehrəliyevanı, Miriş Hüseynovu, Cəmil Tağıyevi, Tofiq Hacıyevi və başqalarını görmək olardı. İndi onların hamısı əbədiyyata qovuşub, qəbirləri nurla dolsun! Həmin günləri xatırlayanda C. Şıxəliyevin nə dərəcədə əhəmiyyətli işlər gördüyünü daha dərindən başa düşürük.

Bütün bu tədbirlərlə yanaşı məktəbdə təlim-tərbiyə işləri uğurla gedirdi. 2004-cü ildə məktəbin kimya müəllimi Oktyabr İsgəndərovun «Əməkdar müəllim» adına layiq görülməsi növbəti uğurlardan biri idi.

2010-cu ilin may ayının 5-də Milli Qəhrəmanı Sahil Ələmdar oğlu Məmmədovla görüş də çox yüksək səviyyədə təşkil olunmuşdu. O, Zəngilanın müdafiəsi uğrunda döyüşlərdə yaralanmışdı.

Mən o tədbirləri sadaladım ki, özüm orada iştirak etmişdim. Elə bilirəm ki, iştirak etmədiyim, qeydə almadığım uğurlu işlər daha çoxdur. Ölkə prezidenti möhtərəm İlham Əliyev 2009-cu ilin noyabr ayında Zəngilan rayonu 4 saylı tam orta məktəbi üçün

inşa edilmiş müasir tipli binanın açılışında iştirak və çıxış etdi.

2010-cu ildə Cəbrayıl Şıxəliyev «Tərəqqi medalı» ilə təltif olundu. O, 2016-cı ildə təhsil sistemində çox illik səmərəli və qüsursuz fəaliyyətinə görə «Əməkdar müəllim» fəxri adına layiq görüldü.

Zəngilan rayonu 4 saylı tam orta məktəbi Zəngilanda yeganə təhsil ocağı idi ki, orada 2 nəfər «Tərəqqi medalına», 2 nəfər isə «Əməkdar müəllim» fəxri adına layiq görülmüşdü.

Cəbrayıl müəllim ictimai-siyasi işlərdə də yaxından iştirak edir. O, 2010-cu ildə yaradılan seçki məntəqəsinin sədridir. Prezident və Parlament seçkilərində (hazırda 26 nömrəli seçki məntəqəsi adlanır) burada heç bir neqativ hal qeydə alınmayıb.

Nümunəvi ailə başçısı olan C. Şıxəliyev dörd övladının (iki oğlan, iki qız) hamısı mükəmməl ali təhsil alıb, yüksək əxlaqları, nümunəvi davranışları, işlərinə olan ciddi münasibətləri sayəsində böyük hörmət qazanıblar. Cəbrayıl müəllim Zəngilanda sayılıb-seçilən ziyalılardandır, xeyirə-şərə yarayan, mərd və qonaqpərvər olduğuna görə digər bölgələrdə də xeyli sayda etibarlı dostları var. 2017-ci ilin oktyabr ayının 24-də Cəbrayıl müəllim 66 yaşı tamam olan günü vəzifəsindən azad edildi. Bəhanə 65 yaş həddi oldu. Halbuki, Cəbrayıl müəllimin başçılıq etdiyi məktəbin uğurları, zehni, fiziki sağlamlığı onun bir neçə il direktor işləməsinə imkan verirdi. Özümlə bağlı bir fakt:

2012-ci ilin yanvar ayının 1-də 65 yaşım tamam olacaqdı. Bir neçə gün əvvəl Zəngilan Rayon İcra Hakimiyyətinin başçısı cənab Ramiz Həsənovun qəbuluna getdim. Ondan xahiş etmək istəyirdim ki, əlaqədar təşkilat və şəxslər mənim təqaüdümü vaxtında və düzgün hesablasınlar, süründürməçiliyə yol verməsinlər. Ramiz müəllim mənə bildirdi ki, siz hələ işləməlisiniz. 2012, 2013, 2014-cü illərdə vəzifəmi icra etdim. 2014-cü ilin iyun ayında Sumqayıtda 5 saylı tam orta məktəbdə yoxlama aparan günün səhərisi qulaqlarımda problem yarandı. Vəzifəmdən azad olunmaq üçün 2015-ci ilin yanvar ayının 5-də Zəngilan Rayon Təh-

sil Şöbəsinə və Təhsil Nazirliyinə ərizə ilə müraciət etdim. Elə həmin gün Təhsil Şöbəsi xahişimi yerinə yetirdi. Lakin Nazirlik məni işdən azad etmədi. İcra başçısı Ramiz müəllimin təşəbbüsü və iştirakı ilə Zəngilan Rayon Təhsil Şöbəsində yanvar ayının 8-də məni təntənə ilə, «Fəxri Fərman» və bir neçə qiymətli hədiyyə ilə yola saldılar. Təhsil Nazirliyi mənim bir neçə dəfə etdiyim xahişi yanvar ayının 21-də yerinə yetirdi. O vaxtkı Təhsil Naziri cənab Mikayıl Cabbarovdan, İcra başçımız Ramiz Həsənovdan mən bu qayğı və diqqəti gördüm. Elə başa düşürdüm ki, Cəbrayıl müəllim 70 yaşınadək işləyəcək Təhsil Nazirliyi tərəfindən böyük bir təntənə ilə, mükafatlarla yola salınacaq. Çünki, 43 il pedoqoji sahədə çalışan, onun 28 ilini direktor vəzifəsində yüksək göstəricilərlə başa vuran Cəbrayıl Şıxəliyev buna layiq idi. Ölkə prezidentinin dəyər verdiyi, mükafatlandırdığı C. Şıxəliyev və rəhbərlik etdiyi 4 saylı tam orta məktəb Zəngilan təhsil sistemində bir mününə, bir etalon idi. Təhsil Nazirliyi heç bir müraciətə, xahişə məhəl qoymadı. Bütün prizmalarda prezidentdən aşağı olan qurum və onun rəhbərliyi bu məsələdə diqqətli olmalı idi. Cəbrayıl Şıxəliyev kimi kadrlara layiqli qiymət vermək onların vəzifə borcu idi.

Gəlin insanlara özlərinin sağlığında diqqətlə yanaşaq!

Cəbrayıl müəllim hazırda ömrünün ən xoşbəxt anlarını yaşayır. Hər adama belə bir xoşbəxtlik qismət olmur. İstəkli dostum Cəbrayıl müəllimə ailə, uşaq və nəvələri ilə birlikdə sağlam can, ruzili-bərəkətli illər arzulayıram!

Dərin hörmətlə, Asif Bağırov, yazıçı-publisist. 23 avqust 2022-il.

**Şıxəliyev İdris Şıxəli oğlu**
*II dərəcəli Şöhrət Ordenli*





Şıxəliyev İdris Şıxəli oğlu 1921-ci ildə Zəngilan rayonunun Qazançı kəndində anadan olub. 1938- ci ildə orta məktəbi bitirən gənc İdris 1939-cu ildə hərbi xidmətə çağırılıb. Hələ dinc dövr idi. Qarşıdakı böyük fəlakətə hələ iki ilə yaxın vaxt var idi.

Müharibə başlananda ön cəbhəyə göndərilən İdris Şıxəli oğlu kəşfiyyatçılar dəstəsində xidmət edirdi. Kəşfiyatçının də əsas işi məlumat və ən əsası da canlı bir düşməni əli keçirmək idi.

1944-cü ildə Ukraynanın Lvov şəhəri ətrafında düşmənin yerini müəyən etmək tapşırığını alan dəstə böyük qənimət, yəni bir düşmən əsgəri ilə geri qayıdır. Bu əməliyyata görə Şıxəliyev İdris Şıxəli oğlu «Şöhrət» Ordeninin III dərəcəsi ilə təltif olunub.

Növbəti əməliyyata gedən dəstəyə artıq İdris Şıxəliyev komandirlik edirdi. Əməliyyatdan geri qayıdan zaman dəstə düşmən qüvvəlri ilə qarşılaşır. Döyüşdə bir yoldaşlarını itirirlər. İdris Şıxəli oğlu isə ağır yaralanır. Bir neçə saat özündə olmayan komandiri əks hücuma keçən sovet əsgərləri xilas edirlər. Bir neçə ay Hospitalda yatır. Bu əməliyyata görə isə o «Şöhrət» Ordeninin II dərəcəsi ilə təltif olunur, marşal Konevin imzası ilə təşəkkür elan edilir.

Müharibədən sonra o Moskvada Ali partiya məktəbini bitirmiş, uzun illər rayonumuzda partiya və sovet orqanlarında mühüm vəzifələrdə işləmişdir. 1963-1988-ci illərdə fasiləsiz Zəngilan rayon XDS İK katibi olub. Onunla bir yerdə təxminən 5 il işlədim. Ondan çox şey öyrəndim. Qərəzsiz, təmənnasız bir

ziyalı idi.

Şıxəliyev İdris Şıxəli oğlu 10 yanvar 2000- ci ildə Bakı şəhərində vəfat etmişdir.

**Şükürov Şükür Həsən oğlu**



Şükürov Şükür Həsən oğlu 1932-ci ildə Zəngilan rayonunun Bürünlü kəndində anadan olub. İlk təhsilini Şayıflı kənd məktəbində alıb, sonra isə Pirçivan kənd orta məktəbini bitirmişdir.

Orta məktəbi bitirdikdən sonra Şükür Həsən oğlu Azərbaycan Pedaqoji İnstitutuna daxil olub. 1953-cü ildə İnstitutu fransız dili ixtisası üzrə bitirib. Ali məktəbi bitirdikdən sonra onu Cəbrayıl rayonunun Böyük Mərcanlı kəndinə göndərmişlər. Orada bir neçə il işləyən Şükür Həsən oğlu sonra rayona qayıtmış və Şayıflı kənd məktəbində müəlllimliyə davam etmişdir.

Sonrakı illərdə rayon mərkəzinə köçmüş və rayonda nəşr olunan «Kənd həyatı» qəzetində əməkdaşlıq etmişdir.

Şükürov Şükür Həsən oğlu bacarıqlı bir kadr kimi Bakı Ali Partiya məktəbinə göndərilir. Məktəbi bitirdikdən sonra onu rayon partiya Komisəsinə təlimatçı işinə təyin etmişlər. Bu vəzifədə bir neçə il işlədikdən sonra yenidən əvvəlki işinə «Kənd həyatı» qəzeti redaksiyasına, bu dəfə baş redaktorun müavini kimi dönür.

Mənim onunla deyərdim ki, ünsiyyətim olmayıb. Onunla birlikdə işləyənlər onun təmiz əqidəli, qərəzsiz, saf biri olduğunu deyirlər. Ünsiyyətdə olmadığımdan onun haqqında tam, dolğun məlumat verməkdə çətinlik çəkdim. Bu arada 50 ildən atrıq bir zaman kəsiyində uzaqdan tanıdığım, son iki-üç ildə isə daha yaxından tanıdığım, mənə ən yaxın olan Asif Bağırovdan Şükür müəllimi soruşdum. Onun dediklərini olduğu kimi sizlərə təqdim edirəm.

-Mən Şükür müəllimi təxminən 1963, ya da 1964-cü ildən tanıyırdım. O vaxt o, Şayıflı kənd məktəbində fransız dilindən dərs deyirdi. Bu illərdə mən məktəblərdə bədii özfəaliyyət müsabiqələrində iştirak edir, daha doğrusu onları yönləndirirdim. O illərdə Oqtay Ələkbərovun sifarşlə düzəltdirdiyi qarmonu var idi. O, yaxşı qarmon çalardı. O, qarmonu mənim dizimin üstünə qoyaraq:

-Asif , binları siz müşaiyət edin, dedi. (Bu dövrdə Asif Bağırov hələ orta məktəbdə oxuyurdu. Orta məktəb illərində o məktəb özfəaliyət kollektivinin rəhbəri kimi bu müsabiqələrdə ifaçıları müşaiyyət edirdi. Ə.S)

Şükür müəllim də müsabiqəyə bir neçə uşaq gətirmişdi. Şükür müəllim heç zaman deməzdi ki, bu uşaq yaxşıdı, o niyə qalib olmadı. O, sakit və təmkinlə durub dinlərdi. Çox mədəni, diqqətli, səliqəli geyinən biri idi. Həmişə şalvarı ütülü, şax olardı. Onun gətirdiyi məktəblilərdən Leyla Sofiyeva «Ahu kimi» xalq mahnısını gözəl ifa etdi. Leyla (onun adının Lyuba olduğunu deyənlər də var) sonralar Zəngilan qəsəbə orta məktəbini bitirib. Rayon müsabiqəsinin qalibləri Bakıya Respublika turuna gedərdi. Sonralar Leyla tibb elmləri namizədi alimlik dərəcəsi adı alıb.

Sonralar Şükür müəllimlə daha yaxından Redaksiyada işləyəndə tanış oldun. O rayon mərkəzinə köçmüşdü və «Kənd həyatı» qəzeti redaksiyasında əvvəl şöbə müdiri kimi işə başladı. 1978-ci ildə redaktor müavini Nəriman Bəxtiyarov dünyasını dəyişəndə Şükür müəllim redaktorun müavini oldu.

Onu da qeyd edim ki, Şükür müəllimin həyat yoldaşı Hürü Mehrəliyeva bu illərdə raykomun əvvəl II katibi sonralar isə Zəngilan rayon XDS İK-nin sədri idi. Şükür müəllim heç zaman bunu biruzə verməz, onun mövqeyindən yaralanmazdı.

Redaksiyada mən Şükür müəllimlə redaktor Mürsəl Qocayevin mətbuat günündə təşkil etdiyi tədbirlərdə görüşürdüm. O, məni də bir musiqiçi kimi həmişə bu tədbirlərə dəvət edərdi. Mən də bundan xeyli məmuniyyət duyar, həvəslə bu işə qoşulardım.

O illərdə məni Zaqafqaziya komsomol məktbinə iki illik kursa göndərmişdilər. Bir aylıq məşğələlərdən sonra rayona qayıdırdım. Elə oldu ki, qatarda bir kupedə Şükür müəllimlə birlikdə gələsi oldum. O, da Bakıdan redaktor müavinlərinin üç günlük müşavirəsindən qayıdırdı. Yemək zamanı mən restorana gedib nə isə almaq istəyəndə, o dedi:

-Sən bir aydı buradasan, mən isə üç gündü. Sən əziyyət çəkmə.

-Mən isə, siz böyüksünüz, siz zəhmət çəkməyin, nə lazımsa mən alaram. Mən restorana gedib lazım olanı aldım.

Günlərin bir günü Məscid qabağında dayanmışdım, daha doğrusu işə gedirdim. Bir də gördüm ki, bir neçə ádam üzü yuxarı gedir. Soruşdum, dedilər ki, Şükür müəllim rəhmətə gedib.

İşə getmədim, birbaşa onlara getdim. Qaynı Nəcəf müəllimlə bacanağı Xuduş İskəndərov da orada idi. Bu dövrdə Hürü müəllimə məzuniyyətdə idi. Amma, dəfnə gəlib çatdı. O Şükür müəllim üçün boz rəngli bir jaket almışdı. Onu məzara qoymaq istəyirdi. Lakin Müriş müəllim bunun dinimizə uyğun olmadığını bildirdi. Molla Əsəd müəllimin qardaşı İsmayıl idi. Mən bu işlərdə təcrübəli olduğumdan Şükür müəllimin dəfnə hazırlanmasında (kəfənlənməsində) yaxından iştirak etdim. Sonra mən Xuduş müəllimlə dəfn üçün yer müəyyən etməyə getdik. Xuduş müəllim hələ heç kəsin dəfn olunmadığı bir yeri təklif elədi. Mən bunun gələcəkdə söz söhbətə səbəb ola biləcəyini deyib başqa yer təklif etdim. Mənim təklifimlə Xuduş müəllim də razılaşdı və biz onu Yusif Məmmədovun yanında olan boş yerdə dəfn etmək qərarına gəldik. Onların taleləri də bir-birinə bənzərdi. Hər ikisi dardan yuxarı idi, hər ikisi övlad toyu görmədi.

Sonda onu deyim ki, xarici görünüşcə bəlkə də bəzilərinə xoş təsir bağışlamaya bilərdi, amma, daxilən və mənən çox zəngin, kübar, alicənab, yerini, sözünü bilən bir ziyalı idi.

Şükür müəllimin ən çox sevdiyi idman növü şahmat idi. 60-cı illərdə rayon idman komitəsinin sədri olan Şəhriyar Quliyev

bir neçə nəfərlə şahmat üzrə seans oyun oynayırdı. Haradasa təxminən 20 nəfərlə. Şükür müəllim də oynayanların arasında idi. O, Salam Cavadlı ilə çox şahmat oynayıb. Salam müəllimin dediyinə görə bəzən səhv gediş eləyəndə üzr istəyib, onu qaytara bilərəmmi-? deyə müraciət edərdi. Onların bir oğlu, bir qızı var.

Şükürov Şükür Həsən oğlu 20 yanvar 1984-cü ildə Zəngilan şəhərində vəfat etmişdir.

**Təhməzov Ziyad Murad oğlu**

*tarix elmləri namizədi*



Təhməzov Ziyad Murad oğlu 15 may 1925-ci ildə indiki Zəngilan rayonunun Sarıl kəndində anadan olub. 1932-ci ildə Sarıl kənd ibtidai məktəbinə qəbul olunub. Məktəb sonra Alıbəyli kəndinə köçürülüb. Ziyad Murad oğlu 1939- cu ildə Həmin məktəbin 7-ci sinfini bitirmişdir. Sovet hökümətinin illərində 7-ci sinfi bitirənlər savadlı hesab olunurdu. Ehtiyac olduğu hallara onlardan ibtidai siniflərdə müəllim kimi istifadə edirdilər. Ziyad müəllim 1939-cu ildə indiki Füzuli (keçmiş Qaryağin) rayonunda pedaqoji məktəbə daxil olur. O məktəbi əla qiymətlərlə oxuduğuna görə onu vaxtından əvvəl dövlət imtahanlarına buraxırlar. İmtahanları verdikdən sonra onu ehtiyac olan yerə müəllim göndərirlər. O rayonun Ağalı kənd məktəbinə gəlir də dərs hissə müdiri kimi əmək fəaliyyətinə başlayır. Sonra isə onu məktəbə direktor təyin edirlər. Müharibədən sonra 1945- ci ildə o Azərbaycan Pedaqoji İnstitutuna daxil olur və 1950-ci ildə oranı bitirir.

Təhməzov Ziyad Murad oğlu 1951-ci ildə iki illik Ali Pratiya məktəbinə göndərilir. 1953-cü ildə məktəbi fərqlənmə diplomu ilə bitirən Ziyad müəllimi rayon partiya Komitəsinə kənd təsərrüfat üzrə katib seçirlər. O illərdə Ziyad Təhməzov Moskvada Sov.

İKP MK yanında Ali partiya məktəbini bitirir. Bundan sonra onu 1960-cı ildə yerli hökumətin sədri seçirlər. Yəni Rayon ZDS İK sədri. Bu çox böyük və məsuliyyətli bir vəzifə idi.

Ziyad müəllim burada çox işləyərdi. Lakin bu ildə Qubadlı ilə Zəngilan rayonunu birləşdirdilər bir neçə aydan da sonra yenidən ayırdılar. Belə olanda sədrliyə Nəzir Kərimov seçildi.

1963- cü ildə onu şəhər orta məktəbinə direktor təyin etdilər. Ziyad müəllim burada düz 10 il gənc nəslin təlim-tərbiyəsi isə həm məşğul oldu, həm də ki, onlara rəhbərlik etdi.

O, məktəbdə işləməklə bərabər elimi yaradıcılıqla da məşğul olmuş, 1972-ci ildə «Sosializm quruculuğunun başa çatması dövründə şəhərinn kəndə hamilik köməyi» mövzusunda dissertasiya müdafiə edərək tarix elmləri namizədi alimlik dərəcəsi adı almışdır. 1974-cü ildə o Naxçıvan Pedaqoji İnstitutuna baş müəllim qəbul olunur. Sonra isə kafedra müdiri kimi elmi və pedaqoji işini davam etdirib. Onun işlədiyi dövrdə şəhərimizə Oxçuçayı üzərində davamlı bir körpü salınıb, ilk musiqi məktəbi açılıb. Onun dörd oğlu, iki qızı var. Təhməzov Ziyad Murad oğlu 25 may 1986- cı ildə dünyasın dəyişib.

**Vəliyev Sultan Musa oğlu**

*Respublikanın əməkdar həkimi*



Zəngilanın ilk həkim kadrı Sultan Musa oğlu Vəliyev olmuşdur. O, 1925-ci ildə indiki Zəngilanın rayonunun Malatkeşin kəndində anadan olub. 1952-ci ildə Tibb İnstitutunu (indiki Tibb Universiteti) bitirib, həkim-cərrah kimi Zəngilanda işə başlamışdır. 1954-cü ildə Zəngilan Rayon Xəstəxanasının baş həkimi vəzifəsinə təyin olunmuş, 1989-cu ilə qədər həmin vəzifədə işləmişdir. 1989-cu ildən 1993-cü ilə kimi

Poliklinika şöbəsinin müdiri vəzifəsində işləyən Sultan Vəliyev rayonun işğalından sonra Bakı şəhərində məskunlaşmış və Yasamal rayonundakı 19 saylı polikilinikada cərrah kimi fəaliyyətini davam etdirmişdir.

Sultan Vəliyev rayonumuzda «Respublikanın əməkdar həkimi» adını alan yeganə həkim olub. Sultan Musa Oğlu Vəliyev 09 sentyabr 2010-cu ildə vəfat etmişdir.

Sültan Vəliyev barədə geniş məlumatı müəllifin 2021-ci ildə çap olmuş «**Zəngilan səhiyyəsinin sultanı**»  kitabından oxuya bilərsiniz.

## Yusifzadə Xavər Rəşid qızı



Yusifzadə Xavər Rəşid qızı 13 fevral 1925- ci ildə Azərbaycanın musiqi beşiyi Qarabağın gözü olan Şuşa qalasında, ziyalı ailəsində anadan olub. Ailədə dörd bacı- qardaş olublar.

Atası Yusifzadə Rəşid dövrünün ziyalı, tanınmış şəxsiyyət-

lərindən olmuşdur. O, rusca-türksə lüğətin müəlliflərindəın biri olub. (Rusca-türkcə lüğət. Azərnəşr, Bakı 1928).

Anası Yusifzadə Haciyə xamın isə evdar qadın olub.

Onlar ailədə iki qardaş, iki bacı idilər. Böyük qardaş Yusifzadə Əkrəm Rəşid oğlu, ikinci qardaşı Yusifzadə İdris olub. Yusifzadə İdris 1941-1945-ci illər müharibəsində işrtirak etmiş, geri qayıtmayıb. Böyük qardaşı Əkrəm isə Bakı şəhərində yaşayıb, 1988-ci ildə dünyasın dəyişib. Ailənin son beşiyi olan Yusifzadə Rəhimə isə tibb texnikumunu bitirib. Əslən Şuşalı olan həkim Cavanşir Babayevlə ailə qurmuşdur.

Yusifzadə Xavər Rəşid qızı orta məktəbi bitirdikdən sonra ikiillik perdaqoji təhsil alıb. Kursu bitirdikdən sonra sənədlərini ali məktəbə verib. Beləliklə 1944-cü ildə indiki N.Tusi adına Azərbaycan Dövlət Pedaqoji Universitetinin Azərbaycan dili və ədəbiyyatı fakültəsinə qəbul ounub. Dörd illik təhsildən sonra 1948- ci ildə ali məktəbi bitirib.

Bu illərdə təbəbə yoldaşı, zəngilanlı Qocayev Mürsəl Eyvaz oğlu ilə tanış olmuş və ailə qurmuşdur. Onlar birlikdə Azərbaycanın Qubadlı rayonuna birgə təyinat alırlar və orada əmək fəaliyyətinə başlayırlar. Hər ikisi Qara İlyasov adına orta məktəbdə Azərbaycan dili və ədəbiyyatından dərs deməyə başlayıb.

Yusifzadə Xavər Rəşid qızı 1948-1963- cü illərdə həmin məktəbdə işləyir. İşlədiyi müddətdə həm müəllim kollektivinin, həm də şagirdlərin dərin hörmətini qazanıb.

Ailə vəziyyəti ilə əlaqədar onlar 1963-cü ildə Zəngilan qəsəbəsinə köçmüşlər. Xavər xanım təqaüdə çıxana kimi Zəngilan şəhər 1 saylı orta məktəbdə Azərbaycan dili və ədəbiyyatından dərs demişdir. Yusifzadə Xavər Rəşid qızı 1985-ci ildə təqaüdə çıxmışdır. Təqaüdə çıxdıqdan sonra o nəvələri ilə gününü keçirmiş, onların ata-anaları ilə bərabər təlim- tərbiyəsi ilə məşğul olmuşdur.

Xavər xanımın Mürsəl müəllimlə evliliyindən iki oğlu, bir qızı olmuşdur.

Böyük oğulları Qocayev Məzahir Mürsəl oğlu 29 may 1950-ci ildə Qubadlı kəndində anadan olub. 1967-ci ildə Azərbaycan Tibb İnstitutuna daxil olmuş oranı müvəffəqiyyətlə bitirmişdir. Qubadlı və Zəngilan Sanitar Epidomoloji Stansiyasında işləmiş, sonra isə 30 il Zəngilan rayon mərkəzi xəstəxanasında baş həkimin müavini işləmişdir. Hazırda təqaüddədir və Masazır şəhərciyində yaşayır.

İkinci oğlu Qocayev Tahir Mürsəl oğlu 10 mart 1953- cü ildə Qubadlı kəndində anadan olub. 1970-ci ildə Azərbaycan Politexnik İnstitutuna daxil olmuş və oranı 1975-ci ildə bitirmişdir. Uzun illər Zəngilan şərab zavodunda işləyib. 14 may 2014- cü ildə Bakı şəhərində dünyasın dəyişib.

Qızı Gülşən 15 mart 1955- ci ildə Qubadlı kəndində anadan olub. 1972-1976-cı illərdə Naxçıvan Pedaqoji İnstitutunda oxuyub. 1976-1991-ci illərdə Zəngilan şəhər 2 saylı orta məktəbdə Azərbaycan dili və ədəbiyyatından dərs demişdir. Ailə vəziiyəti ilə əlaqədar 1991-ci ildə Bakı şəhərinə köçmüş, 1992-2018- ci illərdə Bakı şəhəri, Suraxanı rayonu Yeni Günəşli qəsəbəsində yerləşən 282 saylı orta məktəbdə işini davam etdirmişdir. Hazırda təqaüddədir.

1993-cü ilin oktyabr ayının 29-u Xavər xanımın ömrünün ən ağır, deyərdim ki, faciəli günü olub. Zəngilanı ikinci vətəni kimi sevən Xavər müəllimə qəddar, nankor qonşularımız üzündən isti ocağından məcburi köçkün düşür. Ailəsi, övladları və nəvələri ilə Bakı şəhərində məskunlaşmışıdır. Bu illər həm Xavər xanım üçün, həm də Mürsəl müəllim və eləcədə yaxınları üçün çox ağrılı illər olur. 2005-ci ilin yanvar ayınnın 2-də Xavər müəllimə dünyasın dəyişir. Bu Qocayevlər, eləcə də Zəngilanlılar üçün ağır itki idi.

Yusifzadə Xavər Rəşid qızının xatırəsi onu tanıyanların qəlbində əbədi yaşayacaq. **Yazı Məzahir Qocayevin məlumatı əsasında işlənib.**




**General mayor Məhəmməd Əsədov qələbə günü münasibəti ilə Mədət Quliyevə mükafat təqdim edərkən**



**Şəkildə soldan sağa oturanlar: Haqverdi Nuriyev, Məzahir Qocayev, Elşən Məcidov, Rəfael Əhmədov, Eldar İsmixanov, Kamil Əhmədov, Bayram Həsənov. Ortadakılar, Nəriman Əsədov, Nəzəralı Nəcəfov, APİ-nin prorektoru Vilayət müəllim, Musa Məmmədov, Zülfü Əhmədov. Ayaq üstə duranlar. Məhiyəddin Ağayev, Səhiyəddin Ağayev, Nəriman Bəxtiyarov, Famil Abdullayev, Müzəffər Qocayev, Şövkət İsbəndiyarov.**



**Zəngilan şəhər 1 saylı orta məktəbin ibtidai sinif müəllimi Əntiqə Sailova şagirdlərlə (1965)**




**Zəngilanın giriş lövhəsi. İndiki**



**Sultan həkim xəstəxananın tibbi personeli və dostları ilə birlikdə**



**Soldan sağa Nəcəfin böyük qardaşı Rafiq,**
**Nəcəf və Şamı Bağırov**



**Rayonun müharibə veteranları rayon rəhbərliyi ilə 9 may tədbirində**



**Zəngilanlı həkim və feldşerlər Sultan həkimlə birlikdə**

# Mündəricat


Abbasov İdris Şəmil oğlu....5
Abdullayev Famil Məcid oğlu ....6
Abdullayev Məhəmmədəli Məcid oğlu ....7
Alməmmədov Oruc Müseyib oğlu....7
Atlıxanov Əşrəf İsmayıl oğlu....8
Babayev Eldar Nəriman oğlu....9
Bağırov Asif Kərim oğlu....10
Bağırov Qubad Allahverdi oğlu....12
Bağırov Şamı Kərim oğlu....13
Bağırov Şəhriyar Kərim oğlu....32
Bayramov Həsənalı Alı oğlu....33
Bayramov Həsənqulu Camal o ....35
Bəxtiyarov Nəriman Şahsuvar oğlu....36
Bəşirov Arif Cəbrayıl oğlu....37
Cəfərov Bəxtiyar Cəfər oğlu....39
Cəfərov Alı Mirzəxan o ....39
Cəbrayılova Zoya Hüseyn qızı....42
Cəbrayılov Sərdar Firid oğlu ....43
Əhmədov Tofiq Əli oğlu zərgər....44
Əhmədov Zülfü Şahvələd oğlu....45
Ələkbərova Gülarə İsfəndiyar qızı....51
Əsədov Dağbəyi Nəriman oğlu....52
Əsədov Məhəmməd Nəbi oğlu ....53
Əzimov Əfsər İsak oğlu....58
Heydərov Məhəmməd Heydər oğlu....59
Həsənov Əbil Məmi oğlu ....63
Həsənov Həsən I katibin sürücüsü....66
Həsənov Hidayət Mirzəmməd oğlu ....69
Hüseynov Bəndalı Mehralı oğlu....70
Hüseynov Mutuza Şəmil oğlu....71
Hüseynova Sona Mirzə qızı....72
Hüsüyev Aslan Məhəmməd oğlu....73
Hüsüyev Hüsü Həsən oğlu....74
Göycəyev Xanməmməd Yarməməd o....78
İbadov Baloğlan Bəylər oğlu ....80

İsmayılov İsmayıl Süleyman oğlu ........................................ 81
İsmayılova Xanım Ələkbər qızı ........................................ 82
Kazımov Voroşil Loğman oğlu ........................................ 84
Kərimov Ədil Hətəmxan oğlu ........................................ 84
Qocayev Məsud Şəmşi oğlu ........................................ 85
Qafarov Məmməd Sadıq oğlu ........................................ 87
Qocayev Mürsəl Eyvaz oğlu ........................................ 88
Quliyev İsmayıl Mehti oğlu ........................................ 91
Quliyev Qulu Behbud oğlu ........................................ 92
Quliyev Ədil Oruc oğlu, Quliyeva Sehranə ........................................ 95
Quliyev Şəhriyar Paşa oğlu ........................................ 102
Mehrəliyev Nəcəf Hüseyn oğlu ........................................ 103
Mehtiyev Ərşad İbiş oğlu ........................................ 104
Məcidov Yavər Məhəmmədəli oğlu ........................................ 105
Məhərrəmov Əli Xanış oğlu ........................................ 107
Məmmədov Həsən Paşa oğlu Şöhrət Ordenli müəllim ........................................ 108
Məmmədov Rza Mikayıl oğlu ........................................ 109
Məmmədov İzzət Ağabala oğlu ........................................ 110
Mustafayev Mustafa Əlabbas oğlu ........................................ 111
Mustafayev Vəli Mustafa oğlu ........................................ 112
Paşayev Mübariz Əlixanoğlu ........................................ 113
Paşayev Seyfəddin Teymur oğlu ........................................ 114
Paşayev Yavər Əli oğlu ........................................ 115
Sayılova Əntiqə İsfəndiyar qızı ........................................ 116
Səlimov Nəcəf Əmir oğlu ........................................ 122
Süleymanlı Bəxtiyar İbrahim oğlu ........................................ 131
Süleymanov Koroğlu İsmayıl oğlu ........................................ 133
Şərifov Fehruz Tacəddin o ........................................ 133
Şıxəliyev Arif İdris oğlu ........................................ 134
Şıxəliyev Cəbrayıl Əli o ........................................ 137
Şıxəliyev İdris Şıxəli oğlu ........................................ 144
Şükürov Şükür Həsən oğlu ........................................ 145
Təhməzov Ziyad Murad oğlu ........................................ 148
Vəliyev Sultan Musa oğlu ........................................ 149
Yusifzadə Xavər Rəşid qızı ........................................ 150

